**Əliyev Əli Umud oğlu**

"Ölkəmizi tanıyaq" devizi ilə keçirilən maarifləndirici tur-aksiyaya qoşularaq Laçın rayonu və Ərikli kəndinə aid bəzi bilgilərin açıqlanması

# Laçın rayonuna aid adət- ənənələr, toponimlər və şivə sözləri

**(metodik vəsait)**

**Bakı - 2017**



**Əliyev Əli Umud oğlu**

**Elmi redaktor: dos. İsrafilov Vaqif İsmayıl oğlu**

**Rəyçilər: dos. Fərzəliyeva Mətanət Çərkəz qızı**
**dos. əvəzi Kərimli Tahir Mehdixan oğlu**

Azərbaycan Respublikası Təhsil Nazirinin
08.12.2015-ci il tarixli 1108 saylı
əmrinə uyğun olaraq ADPU-nun Tədris
Metodika Şurasının 08.12.2016-cı il
tarixli iclasının (pr№) qərarına əsasən çap edilir.

## Giriş.

İnsan kapitalının inkişafı təhsil sisteminin başlıca vəzifəsidir. Təhsilalana hərtərəfli bilik və bacarıqların verilməsi baxımından bütün imkan, vasitə və üsullardan istifadə olunmalıdır. Hər bir şəxsin geniş dünyagörüşə, şüurlu dərketmə bacarığına malik olması üçün həmin şəxsin leksikonunun, söz ehtiyatının zəngin olması ən vacib amillərdən biridir. Peşəsindən, sənətindən asılı olmayaraq insanların elmi dünyagörüşü, potensial imkanlarının inkişafı onun dilinin, lüğət fondunun zənginliyi ilə ölçülür. Dili olmayan, ünsiyyət saxlamaq üçün sadə və cılız leksikona malik şəxs bütün peşə-sənət sahələrində irəliyə gedə bilməz, yerində sayar və unudulraq yaddaşlardan silinər. Bu baxımdan bəşər ovladı dilə qyğı ilə yanaşmalı, dili göz bəbəyi kimi qorumalı və gələcək nəsillərə ərməğan etməlidir. Dilin genefondunda olan hər bir detalın əhəmiyyəti böyükdür, öyrənilib öyrədilməsi də vacib və önəmlidir. Təkcə dilin lüğət tərkibinin aktiv fondunda olan ümumişlək sözlərin deyil, passiv fondda olan dialekt sözlərinin, arxaizmlərin də öyrənilməsi böyük əhəmiyyət kəsb edir. Odur ki, muzeyləşən adət-ənənələrimiz və eksponat sözlərimizin, milli-mənəvi dəyərlərimizin qorunması, gənc nəslə öyrədilməsi təhsilalanın dünyagörüşünün hərtərəfli inkişafı, intellektual səviyyəsinin formalaşması, məntiqi təfəkkürünün dərinləşməsi üçün zəmin yaradır.

Ölkəmizin tarixinin, mədəniyyətinin, adət-ənənələrinin, müasir inkişafının öyrənilməsi məqsədi ilə gənclərin bölgələrə səyahətlərinin təşkilinə dair Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin tapşırığına əsasən “Ölkəmizi tanıyaq” devizi ilə maarifləndirici tur-aksiyaların keçirilməsi alqışa layiqdir və ardıcıl olaraq həyata keçirilmişdir. Mən də bu aksiyaya qoşularaq “Vətəni unutmayaq” devizi ilə Laçın rayonu və bu bölgəyə aid düşüncələrim haqqında gənclərimizi maarifləndirmək istəyirəm. Ulu öndər Heydər Əliyev Laçın rayonu haqqında demişdir: “Azərbaycanın müstəqilliyi, ərazisinin

qorunması nöqteyi-nəzərindən Laçın rayonu çox böyük strateji əhəmiyyətə malikdir." Odur ki, Laçın rayonunun ərazisinin çox böyük strateji əhəmiyyət kəsb etdiyini aşağıda göstərilmiş dəyərlərdən də bir daha aydın görmək olar:

1.Laçın rayonunun birinci dərəcəli strateji əhəmiyyətli xüsusiyyəti onun qədim Oğuz yurdu və türk uluslarının yaşayış məskəni olmasıdır.

2.Laçın rayonu elə bir ərazidə yerləşir ki, düşmən o ərazini işğal edə bilmədiyi zamanlarda onu "qara qapı" adlandırmışdı. Bu o "qara qapı" idi ki, vaxtilə onu Soltan bəy tarixi düşmənlərin üzünə bağlamış və onları məğlub edərək rüsvay etmişdir.

3.Laçın rayonunun dünyada analoqu olmayan təbiəti, havası, suyu və sərvətləri də onun strateji əhəmiyyətə malik olan amillərindəndir.

4.Laçın rayonunun yerləşdiyi ərazi Azərbaycan xalqının genoloji düşməni olan erməni hayların sərhəddi boyunca olduğu üçün də strateji əhəmiyyət kəsb edir.

5.Laçın rayonunun ərazisi qədim tarixi türk uluslarının yaşayış məskəni olmaqla bərabər, tarixin yaddaş səlnaməsini vərəqləyə biləcək minlərlə abidələr diyarı olduğu üçün də strateji xüsusiyyət kəsb edir.

6.Laçın rayonu dünyada analoqu olmayan flora və faunaya malik olması ilə də strateji maraq dairəsinə malikdir.

7.Laçın rayonunun təbii şəraiti cəngavər xislətli igidlər yetişdirməklə də strateji xüsusiyyəti qoruyub saxlamışdır.

8.Laçının adət-ənənələri, təbii sərvətinə, havasına, suyuna məxsus xüsusiyyətlərin insanlarda öz əksini tapması; cəsurluq, sözübütövlük, doğru söz demək bacarığı, kişi sözü, mərdanəlik, süfrəsinin, çörəyinin dəlisi(bu ifadə mərdlik məqamı kimi işlənir) olmaq və s. xüsusiyyətlər onun bənzərsiz amillərindəndir. Laçın rayonunda bir nəfər də olsun dilənçi yox idi. Ən kasıb adam rayonun ən mərd adamı sayılırdı.

9.Laçın rayonunda bəlkə də yalandan qurana and içmək olardı, amma "sən öl" və yaxud "mən ölüm" ifadələri ən ciddi

məqamda belə həqiqəti üzə çıxarırdı, “mən ölümə” qan bağışlanardı, kimsə öz ölümünə razı olardı, ancaq saxta “sən öl” ifadəsini işlətməzdi. Ona görə də Laçında kişi sözü strateji məna kəsb edirdi.

# Vətənimizi tanıyaq və tanıdaq baxımından Laçın rayonu haqqında eşitdiklərim, bilgiklərim.

Vətənimizin bir parçası olan Laçın rayonu ən qədim yaşayış məskənidir. Tarixi abidələr, qədim səlnamələr, qayaüstü yazılar fikrimizi təsdiqləyir. Keçən əsrin 50-ci illərindən sonra Laçın rayonu inkişaf etmişdir. Bu illərdən etibarən rayonun sosial-iqtisadi və mədəni həyatında inqilab baş vermişdir.

Azərbaycan KP MK-nın və Respublika Nazirlər Sovetinin «Dağ rayonlarının iqtisadiyyatını daha da yüksəltmək barədə», «Laçın rayonu zəhmətkeşlərinə mədəni-məişət xidmətini daha da yaxşılaşdırmaq tədbirləri haqqında» (16 noyabr 1971), «Laçın şəhərinin **50** illiyi barədə» qərarları keçmiş tariximiz olsa da fəxrlə anılan günlərimizdir. O günlərdə Laçın rayonunda 100-dən çox ümumtəhsil məktəbi, 5 məktəbdənkənar, 3 məktəbəqədər müəssisə, 1 qiyabi orta, 1 orta texniki peşə məktəbi və Bakı 1 saylı Tibb Texnikumunun filialı fəaliyyət göstərmişdir. Həmçinin rayonda 217 mədəniyyət müəssisələri, 30 rabitə, 100-dən artıq tarixi abidə, 42 səhiyyə ocağı, 460 ticarət və ictimai – iaşə, 36 çörəkxana və s. onlarla kommunal xidməti müəssisələri fəaliyyət göstərmişlər. Bütün bunlar Laçının dünənki durumudur. Bu gün Laçın rayonu işğal altında olsa da bütün laçınlılar Laçına qayıtmaq arzusu ilə Laçını yaşadırlar.

Laçın rayonu Qarabağın dağlıq ərazisinin bir hissəsini əhatə edir. Ermənistanla Azərbaycan respublikasının sərhəd rayonlarından biridir. Rayon kimi 1930-cu ildə təşkil edilmişdir. Laçın adını isə Tağı Şahbazi (Simurq) vermişdir. Laçın alıcı quş deməkdir. Sahəsi 1883 $KM^2$ –dir. Bakıdan Laçın şəhərinə qədər məsafə 443 KM-dir. Lakin Laçın şəhərinin bünövrəsi 1924-cü ildə qoyulmuşdur Laçın rayonunun 66 min əhalisi vardır. Laçının bir rayon və şəhər kimi formalaşıb inkişaf etməsində Tağı Şahbazi (Simurq), Hüsü Hacıyev, Ismayıl Şərifov, Qara Ilyasov, Ocaqqulu Musayev, Canbaxış Abdullayev, Muradxan Cabbarov və başqalarının əməyi böyük olmuşdur.

200-ə yaxın mədəniyyət və memarlıq abidələri, yeraltı və yerüstü sərvətləri olan, bənzərsiz bir region, dünyada analoqu olmayan flora və faunaya malik olan Azərbaycanın – "Qüdrətdən səngərli qalalı dağlar" – diyarı – Laçın rayonu 1992-ci il may ayının 18-də ermənilər tərəfindən işğal olunmuşdur. 126 kənd yerlə yeksan edilmiş, 70 min əhali isə pərən-pərən salınmışdır. Laçın rayonu işğal altında olduğuna görə kəndlərin adlı siyahısını burada verməyi məqsədyönlü sayıram:

| | | | |
|---|---|---|---|
| 1. | Ağoğlan | 30. | Bozlu |
| 2. | Alpoud | 31. | Baldırğanlı |
| 3. | Avazlar | 32. | Bülüldüz |
| 4. | Ayıbazarı | 33. | Bozdağan |
| 5. | Ağanus | 34. | Bülövlük |
| 6. | Ağbulaq | 35. | Budaqdərə |
| 7. | Ağcakənd | 36. | Biçənis |
| 8. | Alxaslı | 37. | Cağazür |
| 9. | Ağcayazı | 38. | Cicimli |
| 10. | Arduşlu | 39. | Çorman |
| 11. | Alıcan | 40. | Çıraqlı |
| 12. | Ağalaruşağı | 41. | Çənbər kənd |
| 13. | Bozgüney | 42. | Daşlı |
| 14. | Dəyirmanyanı | 43. | Korcabulaq |
| 15. | Dəyhan | 44. | Kaha |
| 16 | Dambulaq | 45. | Köhnəkənd |
| 17. | Ərikli | 46. | Katos |
| 18. | Əyrək | 47. | Kərəvüz |
| 19. | Əhmədli | 48. | Köhnə Çorman |
| 20 | Alıqulu | 49. | Qarıqışlaq |
| 21. | Ərdəşəvi | 50. | Qılışlı |
| 22. | Ərəb Unannovu | 51. | Qarıkaha |
| 23. | Ələkçi | 52. | Qorçu |
| 24. | Aşağı Fərəcan | 53. | Qarabəyli |

| | | | |
|---|---|---|---|
| 25. | Farraş | 54. | Qoşasu |
| 26. | Fingə | 55. | Qızılca |
| 27. | Fətəlipəyə | 56. | Qışlaq |
| 28. | Güləbird | 57. | Qurdqacı |
| 29. | Hacılar | 58. | Yuxarı Fərəcan |
| 59. | Hətəmlər | 90 | Qalaça |
| 60 | Hacısamlı | 91 | Quşçu |
| 61 | Hüsülü (Soltanlar) | 92 | Qaraçanlı |
| 62 | Haqnəzər | 93 | Qozlu |
| 63 | Hoçaz | 94 | Qazıdərə |
| 64 | Xanalılar | 95 | Qovuşuq |
| 65 | Xırmanlar | 96 | Yuxarı Qarasaqqal |
| 66 | Xumarta | 97 | Aşağı Qarasaqqal |
| 67 | Xaçınyalı | 98 | Qarakeçdi |
| 68 | İrçan | 99 | İpək – II |
| 69 | İpək – I | 100 | Lolabağırlı |
| 70 | Imanlar | 101 | Mişni |
| 71 | Kamallı | 102 | Minkənd |
| 72 | Kalafalıq | 103 | Malıbəy |
| 73 | Mirik | 104 | Seyidlər |
| 74 | Mığıdərə | 105 | Şeylanlı |
| 75 | Mazutlu | 106 | Turşsu |
| 76 | Malxələf | 107 | Şamkənd |
| 77 | Məlikpəyə | 108 | Şəlvə |
| 78 | Mollalar | 109 | Türklər |
| 79 | Mayıs | 110 | Tığik – I |
| 80 | Muncuqlu | 111 | Tərxanlı |
| 81 | Nurəddin | 112 | Təzəkənd |
| 82 | Narışlar | 113 | Tığik – II |
| 83 | Aşağı Cicimli | 114 | Uludüz |
| 84 | Nağdalı | 115 | Vağazin |
| 85 | Oğuldərə | 116 | Vəlibəyli |
| 86 | Pircahan | 117 | Zeyvə |

| | | | |
|---|---|---|---|
| 87 | Səfiyan | 118 | Zerti |
| 88 | Suarası | 119 | Zağaltı |
| 89 | Soyuqbulaq | 120 | Zabux |
| 121 | Sadınlar | 124 | Ziyrik |
| 122 | Sonasar | 125 | Hacıxanlı |
| 123 | Sus | 126 | Ağbulaq |

Göründüyü kimi 126 kənd adı bizə yadigar qalmışdır. Bu adlar oğuz elini bu gün xatırladan mənəviyyat muzeyimizin daşlaşmış eksponat yaddaşıdır. Alpoud (Alpoğuz), Ağcayazı, Çıraqlı, Əyrək, Qorçu, Qurdqajı və s. kənd adları bizə Azərbaycan xalqının qədim tarixindən xəbər verir, oğuz elinin mənəviyyat dünyasının muzeyləşən yaddaşını vərəqləyir, qədim dövrlə bu gün arasında mənəviyyat körpüsü yaradır. Odur ki, öyrənirik ki, bu diyar ən qədim yaşayış məskənlərindən biri olmuşdur. Qeydə alınmış ən qədim məbəd V əsrə aiddir. Bu Kosalar kənd ərazisində olan "Ağoğlan" qəsridir. Lakin qədim dövrlə bağlı abidələrin yozumu və sübütların açımı hələ də öz həllini tapmamış olaraq qalmışdır. Çoxlu abidələrin xaç nişanı altında pərdələnib aşkarlanmaması ən azı soy kökümüzə, tariximizə biganəlik kimi qiymətləndirilməlidir. Çünki xaç ermənilərə məxsus tapınma deyildir. Ermənilər xaçı bizim əcdadlarımızdan 270 il sonra qəbul etmişlər. Əcdadlarımızın abidələrini xaç bayrağı altında özününküləşdirən erməni xalqına qarşı cahad elan etmək lazımdır. Əgər belə edilməzsə, ermənilər Azərbaycan xalqını yer üzündən silib öz arzularını reallaşdıracaqlar. Çünki onlar Alban izini yox edib, erməniləşdiriblər. İndi isə onların qarşılarına qoyduqları məqsəd Azərbaycanı yox etməkdir. Biz isə bunu dərk edib babalardan ərmağan olan vətən torpağını düşmənlərdən azad etməli, onu qoruyub gələcək nəslə təhvil verməliyik.

Laçın haqqında verdiyimiz bu bilgilər aysberqin görünən tərəfləridir. Məlumdur ki, aysberqin görünməyən tərəflərini elmin

gözü ilə görmək lazımdır. Odur ki, elmi araşdırma və tarixi faktlar Laçın haqqında aşağıdakıları söyləyir:

«Bəzən Laçın oykonimi Yalçın, bəzən isə Laçın (yəni quş) yuvası anlamı vermişdir. Bu yolla «Laçın» toponiminin əsl mənasının aydınlaşdırılması işi uzun illər kölgədə qalmışdır. Onu da qeyd etmək lazımdır ki, Laçın-Laçın (ovo) kimi Rusiya Fedarasiyasında şəhərdir.

«Laçın» toponimii bir oykonim kimi 1924-cü ildən xəritəmizdə özünə yer tapmışdır. Ona qədər isə bu ad Yuxarı Laçın adlı kənddə olmuşdur. Qismən qədim xəritələrdə araşdırmalar göstərir ki, Kiçik Qafqazın ən böyük silsiləsi olan Qarabağ sıra dağlarının əsas zirvəsi ilə yanaşı Laçın adlı bir zirvə də diqqəti cəlb edir bu zirvə Yuxarı Qarabağ bölgəsində Böyük Kirs, Kiçik Kirs, Sarı baba zirvəsi ilə üçbucaq təşkil edir. Bu zirvə Qarabağ sıra dağlarının mərkəzi hissəsində, onun cənub qərbində yerləşir. Laçın dağının coğrafi quruluşu onun bir oronim kimi mənasını araşdırmaq baxımından maraq doğurur. Araşdırmalar göstərir ki, «Laçın» Adı coğrafi, tarixi və ədəbi mənbələrdə rast gəlinir. Mənbələrdən göründüyü kimi, «Laçın» toponimii əvvəllər bir oronim-yəni dağ Adı kimi bizə məlum olur. Daha sonralar isə bu toponim tədricən oykonim şəklində özünə bir növ vətəndaşlıq hüququ qazanmışdır. Bunu Laçın adlı kəndlərdə görə bilirik. Qeyd etdiyimiz kimi bu adın sorağı ilə ədəbi materiallara müraciət etdik. Məşhur hind şairi Əmir Xosrov Dəhləvinin həyatından bəhs edən mənbələrdə onun atasının soyadında «Laçın» sözü diqqətimizi cəlb etdi. Onun Adı mənbələrdə aşağıdakı kimi qeyd olunur. Əmir Mahmud Şəms Laçın, Əmir Mahmud Şəmsin adındakı «Laçın» sözü maraq doğurur. Tarixi mənbələrdən aydın oldu ki, onun ata-babası buraya Orta Asiyanın işğalı ilə əlaqədar gəlmişdir. O zaman «Laçın» türk tayfası Türkmənstanın cənubunda Kopetdağında məskun olmuşlar. Hindistanda yaşayıb - yaratmış dövrünün ən böyük şairi kimi ad – san çıxarmış Əmir Xosrov Dəhləvinin adında tayfasının adı göstərilmişdir. Onun əsl adı Əbdül Həsən Əmirbin Əmir

Seyfəddin Mahmud Şəms olmuşdur. Göstərdiyimiz kimi atasının adında «Laçın» sözü var (Az.Sov. Ensk VI cild. Bakı 1980 səh. 203). Ensiklopediyada qeyd olunur ki, o, Orta Asiyanın türkdilli xalqlarından çıxmışdır. O dövrünün böyük Hind şairlərindən Əmir Həsən Dəhləvi də (1253-1337) Əmir Xosrov Dəhləvinin qan qohumu və yaxın dostu olmuşdur.”(30,60)

Qeyd edək ki, indiki xəritələrimizin əksəriyyətində Laçın inzibati rayonu ərazisində eyni adlı çay yoxdur. Lakin xəritədə adı Həkəri olmasına baxmayaraq, yerli əhali bu çaya çox vaxt Böyük çay və ya sadəcə Laçın çayı deyirdilər. Yuxarı Qarabağ bölgəsində Qarqar çaya qovuşan Xəlfəli çayın bir qolu Laçın adlanır. Rəşidəddinin yazdığına görə Oğuzların 24 onqonunun birinin Adı cürə Laçın olmuşdur. Laçın (Laçın) tayfası isə XIII əsrin əvvələrində Türkmənstanın cənubundakı ərazilərdə yaşayırdılar. Müəlliflər göstərir ki, Monqolların hücumu zamanı Laçın tayfalarının bir hissəsi Azərbaycana pənah gətirmişlər. Onlar Qarabağın yuxarı bölgəsində Xaçın (bəlkə də Laçın), Xəlfəli, Qarqar, Həkəri və qismən də indiki Kəlbəcər ərazisindən axan çay hövzəsində məskən salmışlar. Laçınlıların bir hissəsi isə qeyd etdiyimiz kimi Hindistanda sığınacaq tapmışdılar.

Araşdırmalar göstərir ki, Yuxarı Qarabağda məskunlaşmış Laçınlılar indiki Şuşa, Kəlbəcər və Laçın rayonları ərazisində kənd salmışlar, Şuşada bu kəndə Laçınlılar, Laçın rayonunda Yuxarı Laçın, Kəlbəcərdə isə Laçın adı verilmişdir. Bu tayfanın indi də xeyli maddi-mədəniyyət abidələri qalır. Vaxtı ilə Laçınlılar tayasının adları yazılan sikkə də buraxmışdır.

Dədə Qorqud dastanında qeyd olunan Oğuz tayfaları və Oğuz yer-yurd adları ilə səsləşən, həmçinin eyniyyət təşkil edən onomastik vahidlər

Laçın rayonu ərazisində yüzlərcədir. Odur ki, bu rayonun, yəni Laçın ərazisini qədim Oğuz yurdu adlandırmaq heç də təsadüfi deyildir. Burada qeyd etdiyimiz kimi Ağcayazı, Qorçu, Alpoud, Əyrək, Qurdqacı, Uludüz, Ağ qaya, Şirakar, Qırxqız dağı (Qırx Oğuz yurdu), Kiş dağı və s. Bu qəbildən olan onomastik

vahidlər nəinki oğuz eli ilə, hətta daha qədim dövrlə eramızdan altı min il əvvəl mövcud olmuş Şumerlərlə tam eyniyyət təşkil edən leksik anlam kimi özünü göstərir.

«Laçın boyu türk dünyasına adlı igidlər, dövlət xadimləri vermişdir. Onlardan biri əl-Məlik əl-Mənsur Hüsam əd-din Laçın əl-Mənsuri idi. O, 1296-1298-ci illərdə Misir sultanı olmuşdu… Dəməşq şəhərindən şimalda Xan Laçın adlı qala saldırmışdı.

Laçın qəbiləsi Azərbaycanda monqollardan qabaq yaşayırdı. Bunu Orta Əsrlərdə Qarabağda Laçın şəhərinin olması göstərir. Kirakos Qanzaketsi yazır ki, Laçın Həsən Cəlalın qalalarından biridir.

Azərbaycanda başqa bir Laçın şəhəri də vardı. Hətta o, elə bir şəhər idi ki, orada pul kəsilirdi. Bu Orta Əsr şəhəri Çobani xanlarının zamanında daha şöhrətlənmişdi.

Ulu Laçın elinin yadigarı kimi indi Azərbaycanda Laçın şəhəri, Şuşa və kəlbəcərdə Laçın köyləri qalmışdır. Bizə elə gəlir ki, Laçın oğuz tayfalarından biri olub. Onların bir hissəsi səlcuq bəyləri ilə Azərbaycana gəlmiş, bir hissəsi isə Volqa çayı sahillərində qalaraq qıpçaqlarla qarışmışdır».(19,52).

Qədim oğuz tayfalarının adları ilə səsləşən onomastik vahidlər Azərbaycanın bütün rayonlarında bu gün də özünü qoruyub saxlamaqdadır. Məsələn, Abşeron rayonunda Güzdək kəndi, Ağdam rayonunda Quzanlı kəndi,

Ağdaşda-Qaradağlı kəndi, Ovçulu kəndi,

Ağsuda –Bozvənd kəndi, Quzay (Oğuz – ay) kəndi, Qaradağ kəndi

Ağcabədidə – Qiyamədinli (Qayı mətinli – Ə.Ə) kəndi, Boyat kəndi

Bərdədə – Alpoud, Bala Qəcər kəndləri.

Oğuzda – Bayan kəndi, Baş Daşağıl kəndi.

Qazaxda – Alpoud kəndi, Qarayazı qəsəbəsi, Çaxmaxlı kəndi

Goranboyda – Qazançı, Qaradağlı, Alpoud kəndləri

Qaxda – Qıpçaq, Baydarlı, Qaysarlı, Tanğıt, Qoraqan kəndləri

Qubadlıda – Qayalı, Dondarlı, Qazyan kəndləri

Qəbələdə – Uludaş, Dandıx kəndləri

Dəvəçidə – Vələsdi, Bilici Qorqan, Uzunboyad kəndləri

Zəngilanda – Qazançı kəndi

Kəlbəcərdə – Ağ qaya, Tirkeşəvənd, Yanşaq, Boyur kəndləri

Göyçayda – Alpoud, Qarayazı, Ulaşlı, Şıxlı kəndləri

Tərtərdə – Qazyan, Qaradağlı, Bayandurlu kəndləri

Şəkidə – Aşağı Daşağıl, Qaradağlı, Kiş, Oxut kəndləri

Sabirabadda – Qalaqayın kəndi

Salyanda – Boyat kəndi

Tovuzda – Dondar Quşçu, Dondarlı kəndləri

Ucarda – Alpoud, Boyat, Qazyan , qaradağlı kəndləri

Füzulidə – Qaradağlı, Aşağı Güzlək, Dədəli, Qorqan kəndləri

Xaçmazda – Çaxmaxlı, Dədəli, Ağcayazıbuduq, Qalaqayın kəndləri

Cəbrayılda – Qazanzəmi, Tulus kəndləri

Şamaxıda – Ovçulu, Dədəgünəş, Boyat kəndləri

Culfada – Qazançı kəndi

Şuşada – Qaybalı kəndi və s.

Göründüyü kimi bütövlükdə Azərbaycan qədim türk uluslarının yaşayış məskəni – oğuz diyarıdır. Xalqın yaşadığı əxlaqi-mənəvi mühit xalqın yaddaş salnaməsi olan «Kitabi-Dədə Qorqud» dastanında öz əksini tapmışdır. Odur ki, oğuz elinin əxlaqi-mənəvi dəyərlərinin yaşantıları müasir dünyamızın ən qiymətli naxışlarıdır.

Erməni qəspkarlarının törətdikləri vəhşilikləri, məhv etdikləri maddi və mənəvi dəyərlərimizi yaddan çıxarmamaq, bunları yazıya almaq hər birimizin borcudur. Odur ki, Laçın rayonu üzrə olan toponimlər haqında məlumat verməyi önəmli sayıb, imkanım daxilində bəzi araşdırmaları qələmə aldım.

## Qədim Oğuz yurdu, Türk uluslarının yaşayış məskəni, Laçın toponimləri.

Toponimlər xalqımızın tarixi səlnamələrini özündə qoruyub saxlayan mənəviyyat muzeyimizin daşlaşməş eksponat yaddaşıdır. Dünyada istənilən torpaqların ilkin sakin və sahiblərinin kim olması faktını elmi əsaslarla təsdiqləyən toponimlərdir. Toponimlərin dili ilə min illər bizdən öncə olan qaranlıqlara aydınlıq gətirilir, daim torpaq iddiasında olan məkrli erməni—haylara tarixi reallıq sübut və dəlil kimi göstərilir, şərh olunur. Odur ki, etnoqrafik, tarixi, ədəbi materialların, faktların aşkarlanmasına indi yeni səpkidə yanaşma daha vacib və daha zəruridi.

Kainatın ən qədim mədəniyyət ocaqlarından biri də Azərbaycandır. Bu ölkənin altı da, üstü də tükənməz xəzinədir. Hər qarış torpağı canlı bir tarixdir. Bu tarixi yaşadan, minilliklərdən bu günə və sabaha doğru, düzgün məlumatlar verən, babalardan bizə yadigar qalan xüsusi adlardır ki, bunlar dilçilikdə onomastik vahidlər adlanır. Onomastik vahidlər bütün dünyanın ünvan dilidir, tarixi pasportudur, etnik sikkəsidir. Hər bir regionun özünəməxsus onomastik vahidləri mövcuddur.

Laçın rayonuna aid onomastik vahidlərin 99%-ni milli dil vahidləri təşkil edir. Bu barədə f.e.n. Elşad Abışov yazır:”Laçın rayonunun ərazisi qədim dövrlərdən başlayaraq Azərbaycan xalqının təşəkkül prosesində içtirak etmiş türk uluslarının yaşayış məskəni olmuşdur.Ona görə də istər qədim,istərsə də müasir el-oba adlarını köksündə yaşadan bu qədim Azərbaycan diyarının toponimiyasının əksər hissəsini milli dil vahidləri hesabına yaranan yer adları təşkil edir.”(14,7)

Çox təəssüflər olsun ki, son dövrlərdə çap olunan elmi mənbələrdə Laçın rayonuna aid onomastik vahidlər nədənsə təhrif olunur, bir sıra adlar ya bilərəkdən və yaxud bilməzlikdən heç bir məntiqə sığmayan tərzdə izah edilir. Belə yanlış izah olunmuş toponimlərdən bir neçəsinə nəzər salaq:

2005-ci ildə çap olunmuş Nazim Tapdıqoğlunun “Laçın rayonu və onun toponimiyası” (2,168)2007-ci ildə AMEA-nın Nəsimi adına Dilçilik İnstitutu tərəfindən çap edilmiş “Azərbaycan toponimlərinin ensiklopedik lüğəti”(2 cilddə,3,181,I cild) kitablarında **Alıqulu** kəndi Əliqulu adı altında izah olunur və Alıqulu adı tamamilə sıradan çıxarılmışdır.

Laçın rayonunda Əliqulu kəndi olmayıbdır, bu kəndin adı Alıqulu olub və bu gün də rəsmi sənədlərdə Alıqulu/ Alqulu kimi yazılır.

“Yerli sakinlərin məlumatında qeyd olunur ki, kəndi Qarabağ xanı İbrahim xanın sərkərdələrindən biri, əslən Laçın rayonun Ərəbli/Araflı kəndindən olan Qara Murtuza binə etmişdir. Belə ki, Qarabağ xanlığının İranla apardığı müharibələrin birində Qara Murtuzanın oğlu Alı həlak olur. Bu münasibətlə İbrahim xan ona beş qul bağışlayır. Qara Murtuzanın Ərəbli kəndi yaxınlığında saldığı yeni yaşayış məntəqəsi həmin qulların adı ilə Alıqulu/Alının qulları adlandırılır.”(14,10).

Alıqulu kəndi bu gün də öz əhalisi və Alının nəsli ilə tanınır. Alı uşağı adlanan bu nəslin bütün türk dünyasında tanınmış simalarından biri Firudin Daryaldır (1901-1986). Firudin Daryal Türkiyənin Milli Qəhrəmanı olmuşdur. Onun oğlu Alı (Babası Murtuza oğlu Alının adını daşıyır) hal-hazırda Türkiyə Mərmərə Universitetinin professorudur.

Firudin Daryal səksən beş yaşında İstanbulda vəfat etmiş, ”Qaraca Əhməd” qəbristanlığında dəfn olunmuşdur. Onun baş daşında: ”İstiqlal hərbi qazisi Şuşa şəhərinin 25 kilometrliyində Təzə kəndin Uzun Alı nəslindən.....” sözləri yazılmışdır. (2,1-15)

Məncə, belə bir izahatdan sonra heç zaman Alıqulu adlanan kəndin adını Əliquli yazmayacaqlar.

“**Cüdələr** or.,sadə. Lacın r-nunun Çorman kəndindən c-da dağ. Şəlvə və Piçənis çayları arasındadır. Hün. 2076 m. Dağ əvvəllər cüdələr adlı bir nəslin yaylaq yurdu olduğundan həmin nəslin adını daşıyır. Etnotoponimdir.” (3,126,I cild)

Cüdələr adlı dağ eynilə Nazim Tapdıqoğlunun "Lacın rayonu və onun toponimiyası" və Elşad Abışovun "El-oba adlarının izi ilə" kitablarında da verilmişdir. Lakin bu dağın adı Cüdələr deyil, Cidalardır. Həmçinin nəsil adı daşımır, hündür dağlar sırasında ən hündürünə xalq Cida adını vermiş və bu hündürlükdə olan Əmrəpirgic, Göl yeri, Oyuğun yalı kimi sıralanan dağ silsiləsinə birlikdə Cidalar adlandırmışdır. Hətta xalq arasında Əmiraslan adlı bir nəfərin aşağıdakı deyimi bu gün də cöylənilir:

Əmrəpirgic, Göl yeri, Cidalar,
Dəli könlüm səndə yar davalar.
Hürküşdü yaşılbaş sonalar,
Hec bilmədim hayana getdi.

"Cidanı cuvalda gizlətmək olmaz" məsəlinə uyğun olaraq dik, hündür anlamı aydın olur. Cida qədim döyüş silahının adıdır. Deməк, bu söz cüdə deyil, cidadır.

"**Şamkənd**.Yaşayış məntəqəsi XIX əsrin ortalarında Qasımuşağı (və ya kürdhacı) adlı kicik tayfaya mənsub cəmi 3 ailənin Sam adlı qışlaqda məskunlaşması nəticəsində yaranmışdır..."(3,207,II cild)

**Burada və Ələkçi, Ərikli** toponimlərinin izahında tayfanın adının Qasımuşağı olduğu qeyd edilmişdir. Amma mötərizədə "kürdhacı tayfası" sözü yazılmışdır ki, böhtan və şayədir. Kürdhacı sözü Qurdqajı sözünün təhrif olunmuş formasıdır. "Oykonim yerli əhalinin dilində Qurdqajı kimi tələffüz edilir və "qurd aşırımı"şəklində izah olunur. Kəndin adının belə dəyişməsi. (yəni, Kürdhacı şəklinə düşməsi. Ə.Ə.) rus dilində olan ədəbiyyatdan uğursuz tərcümənin nəticəsidir. " (3,295,I cild). Burada yanlış olaraq kəndin keçmiş adının Qasımuşağı olması vurğulanır ki, bu yanlışlıq Qasımuşağı tayfasına da aid edilir. Qurdqajı, Ərikli, Ələkçi, Nağdalı, Samkənd və Yuxarı Çorman adlanan kəndlərin əhalisi Qasımuşağı tayfasına aiddir. Kürdhacı tayfası bu ərazidə olmayıb. Qasımuşağı adlanan tayfa da Azərbaycan türklərinə mənsubdurlar. Qurdqajı adının rus dilindən

tərcümədə Kürdhacı kimi səslənməsi nəticəsində yaranan Kürdhacı adının nə tayfaya, nə də yerli adlara heç bir uyarlığı yoxdur.

“**Zağaltı** oyk., mür.Laçın r-nunun Quşçu i.ə.v.də kənd. Mıxtökən silsiləsinin yamacındadır. Oykonim zağa (mağara) və altı (yanında, aşağısında) komponentlərindən düzəlib. Kənd mağaralı dağın aşağısında yerləşdiyi üçün belə adlandırılmışdır.” (3,289,II cild).

Burada da yanlış məlumatlar verimişdir. Zağaltı kəndi Quşçu i.ə.v.nə aid deyil, Qorçu i.ə.v.da kənddir. Bu kənd mağaralı dağın aşağısında deyil, mağaranın (zağanın) ətrafında və çayın sağ və sol sahilində salınmışdır. Həmçinin Zağaltı kəndi Dəmirçi dağının ətəyində yerləşirdi. Dəmirçi dağının adını da yanlış olaraq Zağaltı dağı kimi vermişlər. Mənə bu məlumatları söyləməyiblər, mən haqqında danışılan kəndlərin və dağların hər qarışına bələdəm. Odur ki, belə yanlışlıq məni vadar edir ki, həqiqəti yazıb ortaya qoyum.

“**Ardaşava** or. mür., Laçın rayonu ərazisində dağ. 1917-ci ildə həmin ərazidə Ardaşava adlı yaşayış məntəqəsi qeydə alınmışdır. Yerli əhalinin dilində Ərdəşəvi kimi tələffüz edilən bu oronim çox vaxt kürd dilində ardaş (ardıc ağacı), (-a bitişdirici sait) və ya (yer) komponentlərindən ibarət söz kimi “ardıclı dağ” mənasında izah olunur. Güman ki, Ardaş (keşikçi daş) dağın adı, Ardaşava (“Ardaş dağı olan oba”) isə kəndin adı olmuşdur.” (3,45,I cild).

“**Ardaşava** oyk. sadə. Laçın r-nunun Təzəkənd i.ə.v .-də kənd. Dağətəyi ərazidədir.Adını ərazidəki eyni adlı dağdan almışdır.Bəzi mənbələrdə Ərdəşəvi kimi verilmişdir.” (3,45,I cild).

“**Ardaşavasu** hidr., mür., Laçın və Daşkəsən r-ları ərazisində çay. Şəlvə çayının qoludur. Adını ərazidəki eyniadlı yaşayış məntəqəsindən almışdır.” (3,45.I cild).

“**Ərdəşəvə** oyk. mür. Laçın r-nunun Təzəkənd i.ə.v.-da kənd.Tədqiqatçılar toponimin kürd dilində ardaş (ardıc ağacı) və

ya (yer) sözlərindən ibarət olduğunu yazırlar. Toponim ”ardıclı yer” mənasını daşıyır.” (3,184,I cild).

Yuxarıdakı nümunələrdə (Ardaşava, Ardaşavasu, Ərdəşəvə) yol verilmiş təhriflər ondan ibarətdir ki, **Ərdəşəvi** adı müxtəlif formalarda verilib, kürd dilinə uyğun anlamlarda izah olunmuşdur. Lakin Ərdəşəvi və Arduşlu kəndlərinin əhalisinin hamısı milli tərkibcə Azərbaycan türklərindən ibarətdir. Bu kəndlərdə bir nəfər də olsun kürd yaşamır. Bəs necə ola bilər ki, kəndin adı kürd dilində ifadə olunsun?!

Ərdəşəvi kəndinin yaxınlığında qədim bir daş abidə vardır. Bu abidəyə kənd camaatı “Ər daşı” deyirlər. Bu daş hündür bir səhnəni xatırladır. Buradan çıxış edib, nitq söyləyirmişlər. Bu daş kürsüyə bənzəyir.Yaşlı kişilər söyləyirlər ki, qədim zamanlarda ər (kişi) sayılan və öz sözünü deyə bilən başçı burada hündür yerə çıxıb toplanmış kütlə qarşısında çıxış edərmiş. Ona görə də burada sanki onun heykəlini yaratmışlar. Xalq bu daşa “ər daşı”, yəni xalqa sözünü deyə bilən kişinin, ərin daşı deyirmişlər. ”Ər daşı” bu kənddə yerləşdiyi üçün kəndi həmin “Ər daşı”nın məskəni, evi adlandırmışlar. Ərdaşevi/Ərdəşəvi adı belə formalaşıbdır. Yerli əhalinin ləhcəsinə uyğun olaraq daş-dəş, ev isə əv şəklində formalaşıbdır. Laçın rayonunun bəzi kəndlərində a-ə səs əvəzlənməsi özünü göstərir. Məsələn, Paşa əvəzinə Paşə, maşa əvəzinə maşə deyirlər. Ona görə də Ərdaşevi ifadəsindəki daş sözünün dəş şəklində tələffüz olunması bu baxımdan təbii və normal sayılmalıdır. Burada ev sözü də əv şəklində tələffüz olunur. Yəni, Ərdaşevi Ərdəşəvi şəklində dilimizdə işlənir. Ərdəşəvi kəndinin ətrafında olan dağ və çay da Ərdəşəvi dağı, Ərdəşəvi çayı adlanır. Bunlara da Ardaşava, Ardşavasu donu geyindirib qəlizləşdirmək yersiz və mənasız quraşdırmadır. Həmçinin Ərdəşəvi kəndinin tarixi qədim dövrlərlə səsləşir. Belə ki, bu kənddə olan “Ər daşı” abidəsi Alban dövrünün abidəsidir. Kəndin formalaşması da qədimdir.Çünki Alban dövrünün məfhumunu insanlar nəsildən-nəslə ötürərək bu günümüzə qədər gətirib çıxarmışdır. Kəndin adının 1917-ci ildə qeydə alınmasının

vurğulanması, ümumiyyətlə, Laçın rayonuna aid toponimlərin XIX əsrdə bünövrəsinin qoyulmasının rəsmiləşdirilməsi naqislikdir. Ermənilər dünyaya səs salıb bar-bar bağırırlar ki, Qarabağ bizimdir, azərbaycanlılar buraya son vaxtlar gəlib, məskunlşıblar. Biz isə çap etdirdiyimiz mənbələrdə kəndlərimizin yaranma tarixinin XIX əsrlə bağlayırıqsa, bununla nə demək istəyirik?! Kimə xidmət edirik?! Hanı bizim məntiqimiz, hanı bizim milli maraqlarımız?!

Daha bir məsələyə də diqqət yetirək. Laçın rayonunda Arduşlu kənd i.ə.v.-də vardır. Hal-hazırda əhalisi 564 nəfərdir və əhalinin milli tərkibi Azərbaycan türklərindən ibarətdir. Heç bir elmi mənbədə Arduşlu kəndi adı altında toponimə rast gəlmədim. Lakin bu anlamın izahı "Ərdəşəvə" (3,184,I cild) sözünün leksik anlamı altında izah olunmuşdur. Həmçinin burada kürd dilində olan anlamlara uyğun yozumlar söylənmişdir ki, burada da məntiqsizlik özünü göstərir. Belə ki, Ardıclı (Arduşlu) sözünün komponentləri açıq, aydın ardıclı yer mənalarını verir ki, bu da Azərbaycan dilindədir, əlavə izaha ehtiyac yoxdur. Arduclu sözünü Ərdəşəvə eləyib kürd dilində izah etməyin mənası kimə gərəkdir?! Həmçinin ər daşı evi, ər daşı obası, ər daşı yurdu, ər daşı məkanı, keşikçi daş mənalarını əks etdirə bilən Ərdəşəvi sözünü Ardaşava, Ardaşavasu, formalarında təqdim etməyin mənası, məncə, fikri başqa istiqamətə yönəltmək, kiməsə xidmət etmək deməkdir. Bu isə Azərbaycana və Azəbaycançılıq idealogiyasına qara yaxmaq kimi bir təxribatdır.

"**Əyrək oyk.** sadə. Laçın r-nunun köhnə kənd i.ə.v.-da kənd. Qarabağ silsiləsinin yamacındadır. **Əyrik, Əkərək, Aqarak Akarak** variantlarında da qeydə alınmışdır. Tədqiqatçıların fikrincə, oykonim mənşəcə Şumer dilinə aid aqar/ akar (əkin yeri, əkilən sahə) sözü ilə bağlı olub, "sahibkar mülkü", "sahibkar təsərrüfatı" mənasındadır." (3,189, I cild) və yaxud "Əyrik" bax:" Əyərək". (3,190,I cild).

Həqiqətən də Laçın rayonunda Köhnəkənd i.ə.v.ya daxil olan kəndlərdən biri də Əyrək kəndidir.Yuxarıdakı verilmiş

sitatdan aydın olur ki, Əyrək kəndi Əyərək, Əyrik adları ilə də adlandırılır və çox gözəl elmi izahla verilmişdir. Belə ki, bu anlamın e. ə. 6 min il əvvələ Şumerlər dövrünə aid olduğu qeyd olunur. Lakin **Həkəri** çayı haqqında verilən bilgidə bu çayın adının izahı belə qeyd edilir: ”.....Keçmiş adı **Alban (Ağvan)** olmuşdur. XIX-XII əsrlərə aid ərəb mənbələrində **Arrançay** adlanır və Araza töküldüyü göstərilir. **Əkərə** də adlanır. Görünür sonralar kürddilli həkəri tayfasının ətraf ərazidə məskunlaşması ilə əlaqədar tədricən həmin tayfanın adı ilə tanınmağa başlamışdır.” (3,225,I cild.) Burada maraq doğuran odur ki, Həkəri adının qədim ifadə tərzləri verilir və Əkərə adlandığı da qeyd olunur. Bu da yuxarıda öz əksini tapmış və aqar/akar deyimlərinə uyğun gəlir, yəni Əkərə çayı “əkin yeri”, ”əkilən sahə”lərin suvarılması mənasında, yerin əkərinə uyğun suvarılması üçün yararlı çay mənasını verir. Əkərinə sözü bu gün də dilimizdə işlənir. Məsələn, bu sahəni əkərinə şumlamaq lazımdır.Yaxud da bu işi əkərinə salmaq lazımdır. Bu söz xalis türk sözüdür.

“**Şəlvə**.....hidronimi kürd dilindəki şelli (bulanıq) və av/ava (su) komponentlərinin birləşməsindən düzəlib, ”bulanıq su” mənasındadır. Əslində çayın adı Azəbaycan dilinin dialektlərindəki şel (burada qol-budaq) və İran dillərindəki ab sözünün yerli tələffüz forması olan av/ava (su) sözlərindən düzəlib, ”çay qolu, su qolu” mənasındadır.” (3,213,II cild).

Əvvəla onu qeyd edim ki, Şəlvə adı çayın sahilində salınmış kəndin adından götürülüb çaya aid edilmişdir. Sonra bizə məlum olan bir məsələni də diqqətə çatdırım ki, bu kəndin bünövrəsini Şəvə adlı şəxs qoymuşdur. Söyləyirlər ki, kənd onun adı ilə Şəvə adlanmış, sonralar isə Şəlvə şəklində tələffüz olunmuşdur. Belə bir variant da söyləyirlər ki, kəndin bünövrəsini qoyan şəxs Şərvə olmuşdur. Odur ki, kənd əvvəllər Şərvə sonradan isə Şəlvə kimi səslənmişdir. “l” və”r” samitləri sonor samitlərdir və bir-birini əvəz edə bilirlər. Şərvə adı isə qədim alban tayfasına məxsus addır. Şərvə qədim alban ərmən tayfasından olan igid bir türk

oğlunun adıdır və Nizami Gəncəvinin "İsgəndərnamə" əsərində Şərvə adı qeyd olunmaqla, onun haqqında belə bir məlumat da verilir:

Ərməndən acıqlı igid bir oğlan,
Vurub öldürməkdə cəsur pəhləvan.
Adı Şərvə, özü döyüşdə kamil
Nə aslan tay idi ona, nə də fil. (39, 332.)

Bu xalq etimalogiyasıdır. Amma Şəlvə sözünün kökü dilimizdə işlənən şəl sözündəndir. Şəl sözü "Azərbaycan dilinin orfoqrafiya lüğəti" kitabında "şəllik" (5,603) formasında verilmişdir, lakin "Azərbaycan dilinin izahlı lüğəti"ndə bu söz izah olunmamışdır. Sahəni şəl basıbdır. Şaxlı-şəvəlli sahədə təmizlik işləri aparıldı. Cümlələrində işlənmiş şəl sözü ot-əncər,fızıllıq mənalarını verir. Şəlvə sözünün mənası kollu-koslu, şaxlı-şəvəlli yerdə salınmış kənd deməkdir. Şaxlı-şəvəlli sözündəki şəvəl komponentindən (v-l səsdəyişməsi nəticəsində) Şəlvə ifadəsi formalaşmışdır. Odur ki, Şəlvə sözünü İran dillərində, kürd dilində araşdırmaq bayağı bir işdir. Şəlvə kəndinin 768 nəfərdən ibarət olan əhalisi milli tərkibcə hamısı Azərbaycan türklərindən ibarətdir. Odur ki, saldıqları yaşayış məntəqəsinin adını da milli anlama uyğun ifadə etməlidirlər. Şəlvə sözü türk mənşəli sözdür.

"**Sadınlar......gələxçu** tayfasının tirələrindən biri olan sadınlar qoluna məxsus ailələr burada məskunlaşmış və kənd də onların adı ilə adlandırılmışdır." (3,169,II cild). Burada diqqəti **gələxçu** şəklində yazılmış tayfanın adına cəlb etmək istərdim. Bu tayfanın tarixi qədim dövrlərlə bağlıdır, oxçu oğuz tayfalarının yadigarıdır. Onlar bu gün gəlovçu adlanırlar, gəloxçu da adlandırmaq olar, lakin hələlik gəlovçu kimi işlənir. Gəlovçu, gəloxçu adını "gələxçu" kimi vermək olmaz. Bir səs böyük mənalar yaradır. Odur ki, "yüz ölçüb, bir biçmək" lazımdır. Hər bir işıq üzü görən kitabda birinci növbədə milli maraqlar nəzərə alınmalıdır.

Mənəviyyat muzeyimizin daşlaşmış eksponat yaddaşı olan onomastik vahidlərin təhrif olunması milli genimizə vurulan zərbədir. Çünki bu adlar soykökə, ulu yaddaşa, milli anlama bağlıdır. Burada zəncirin qırılması dərin zülmət quyuya yuvarlanmaq deməkdir. Bu zənciri ermənilər hər an qırmağa çalışırlar, amma biz özümüz qırırıqsa, buna nə ad vermək olar?! Bu məsələ barədə obyektiv və real nəticə çıxarıb, düzgün qiymət verən, doğru təklif irəli sürən Məmməd Aslandır. Damarlarında milli qan axan, milli genə mənsub, Dədə Qorqud soylu və Dədə Qorqud xislətli xalqın şairi Məmməd Aslanın 1981-ci ilin avqust ayında Basarkeçərdə qələmə aldığı "Ad–Tarixin yaddaşı" şeri deyə biləcəyimdən də artıq ürək döyüntülərimi ifadə etdiyi üçün burada həmin şeirdən bir neçə bənd verməyi vacib və məqsədəuyğun sandım:

Ad–torpağın möhürü,
Ad–tarixin yaddaşı.
Ad tanıdır bir yeri,
Ad yaşadır dağ-daşı.

Kəlmələr itirmişik:
Hər birində bir tarix.
Tarix sözə ilişik:
Vaysınmadan atarıq.

Sonra qalarıq naçar;
Açar tapmaz bir igid.
Belə itdi "Basarkeçər",

"Qara yazı", "Baş keçid"...
"Dərəçiçək" adıyla
Dərələrcə itmişik.

Təzədən yüz yol hayla,
Biryolluq qeyb etmişik.

“Axta” adı fəryadla
Zoğaltək axtalanıb.
Talan olmuş çox adla
Varlığımız talanıb.

Ad–yurd, yuva, ad– Vətən!
Ad–sərhəddə dik hasar!
Ad canlıdır xilqətən,
Qalxışıb ordu basar.

Tarix ölürmü ki,
Tarixi ad da ölə?!
Ad ölür, qalır yükü...
Ölən adlarda nalə

Tarix hopub hər ada,
Beşgünlük qonaq deyil.
Ad dəyişmək dünyada
Oyun-oyuncaq deyil...

“Minlərlə söz --- minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə --- sözün arxeloqu olmaqla elmi daha da zənginləşdirmək, tarixi saxtalaşdırmalardan xilas etmək olar.”(22,315.)

Vahid millətə mənsub olan çoxsaylı Türk xalqları tarixən dünyanın müxtəlif ərazilərində məskunlaşmışlar. Bu faktı qoruyub saxlayan Türk mənşəli onomastik vahidlərdir. Türk mənşəli onomastik vahidlər dünya miqyasında — Balkanlarda, Bolqarıstanda, Rusiya Federasiyası, Orta Asiya respublikaları,

Türkiyə, İran, İrak, Zaqafqaziya və s. ərazilərdə geniş yayılmışdır. Bu da Türk xalqlarının tarixən geniş ərazilərin sahibi olmasından xəbər verir.

Azərbaycanın böyük strateji əhəmiyyət kəsb edən Laçın bölgəsində də ortaq Türk adları geniş yayılmışdır. Bu isə Laçının qədim Oğuz yurdu, Türk uluslarının yaşayış məskəni olmasından xəbər verir.

Laçın rayonu ərazisində qorunub saxlanılan qədim Türk mənşəli alaşar (alışar), art, bair, bay, parmaq, bet, bük, yazı, kömür, sarp, çal və s. terminlər bəzi onomastik vahidlərin tərkibində bu gün də işlənməkdədir. Belə sözlərdən bir neçəsinə diqqət yetirək.

Alaşar (alışar) sözü qədim Türk dillərində "alçaq dağ" mənasında işlənir. Laçın rayonunda Alaşar qaya adlanan yer vardır.

Art sözü qədim Türk mənşəlidir, "dağ keçidi", "aşırım" və s. mənaları bildirir. Salvard zirvəsi, Salvard yaylası.

Bair qədim Türk dillərinə aid sözdür, "təpə", "yüksəklik", "dağ tirəsi" və s. mənalarını bildirir. Çalbair dağı Dambulaq kəndi yaxınlığındadır. Çal sözü türk dillərində "təpə", "daş" mənası bildirir. Çalbayır sözündə bayır komponenti "dağ döşü", "yamac" mənasında işlənmişdir.

Bay sözü qədim Türk dillərinə aiddir, "varlı" mənasındadır. "Kitabi - Dədə Qorqud" dastanında da bu sözə rast gəlirik. "Qadir Tanrı verməyincə ər bayımaz." (26,19.) XVI−XVII yüzilliklərdə Laçın rayonunda yaşayıb yaratmış və Laçın rayonunun Güləbird kəndi yaxınlığında məqbərəsi olan, bayatı ustası Sarı Aşiq də bağlama xarakterli bayatılarından birində bay sözünü qədim və ilkin anlamında işlətmişdir

Mən Aşiq bayı keçdim,
Kasıbı, bayı keçdim.
Altı camış, yüz keçi,
Qucaqda çayı keçdim.

Laçın rayonunun Mirik kəndi yaxınlığında Bayqara dərəsi adlanan yer vardır.

Parmaq sözü qədim Türk dillərinə aiddir, "təpə" anlamında işlədilir. Laçın rayonunda Barmaqlar dağı vardır.

Bet sözü bat şəklində də işlənir. "Dağın yamacı", "dağın döşü", "yüksəklik" mənalarını bildirir. Laçında Çarçanbent dağı, Çarçanbent təpəsi qeydə alınmışdır.

Bük sözü qədim Türk dillərində "dar yarğan", "dağ keçidi", "ensiz dağ vadisi" və s. mənalarında işlənir. Minkənd kəndi yaxınlığında  Büktəpə adlanan yer vardır.

Yazı sözü qədim Türk dillərində "çay, dəniz kənarı", "çöl", "düzən" mənalarında işlənir. Laçın rayonunda Ağcayazı kəndi, Ağcayazı dağı, Ağcayazı düzü, Ağcayazı təpəsi, Ağcayazı çölü vardır.

Sarp sözü qədim Türk dilində "uçurum", "çətin keçilən qaya", "sıldırım dağ" və s. mənalarda işlənir. "Kitabi – Dədə Qorqud"da da sarp sözü işlənmişdir. "Sarp yürirkən Qazılıq ata namərd yigit binə bilməz, binincə binməsə, yeg!" (26,20.) Laçın rayonunun Mişni kəndi yaxınlığında Sapavur — Sarpavur təpəsi qeydə alınmışdır.

Qeyd olunmuş real faktlara əsaslanaraq deyə bilərik ki, Laçın rayonu ərazisinə aid qədim Türk mənşəli onomastik vahidlərin bu günə qədər qorunub saxlanılması Türkdilli tayfaların bu yerlərin ən qədim sakinləri olmasını təsdiq edir. Həmçinin burada yaşayan sakinlər də türk olmuşlar ki, bu günə qədər tarixi reallığı qoruyub saxlamışlar. "Laçın rayonunun ərazisi qədim dövrlərdən başlayaraq Azərbaycan xalqının təşəkkül prosesində iştirak etmiş türk uluslarının yaşayış məskəni olmuşdur. Ona görə də istər qədim istərsə də müasir el-oba adlarını köksündə yaşadan bu qədim Azərbaycan diyarının toponomiyasının əksər hissəsini milli dil vahidləri hesabına yaranan yer adları təşkil edir." (4, 7.)

Laçın rayonu ərazisində tarixən nəsillər dəyişsə də bu yerlərin ilk sakinlərinin toponimlərdə qoyduğu izlər, adlar

dəyişməz olaraq qalır. Odur ki, Türk xalqlarının keçmişin özündə yaşadan etnonim mənşəli yer adları yüzlərcədir. Bunlara əsasən müəyyənləşdirmək olur ki, hansı etnoslar burada vaxtilə məskunlaşmışlar. Burada tarixən məskunlaşan türkdilli tayfanın və həmin tayfanın adı ilə adlanan toponimin adlarına aşağıdakıları misal göstərmək olar:

Laçın tayfası ------- Laçınkənd kəndi.
Minq/mink tayfası ------- Minkənd kəndi.
Maq, mağ/muğ tayfası ------- Mağouz dərəsi.
Quşçu tayfası ------- Quşçu kəndi.
Abdal tayfası ------- Abdallar kəndi.
Boz ulusu, tayfası ------- Bozlu kəndi.
Peçənə ulusu, eli ------- Piçənis kəndi.
Çor tayfası ------- Çorman kəndi.
Sadak tayfası ------- Sadınlar kəndi.
Siraq (çiraq) tayfası ------- Çiraqlı kəndi.
Bayandur tayfası ------- Bayandur kəndi.
Qızılca tayfası ------- Qızılca kəndi.
Bozdağanlı tayfası ------- Bozdağan kəndi.
Alpout tayfası ------- Alpout kəndi.
Ağca tayfası ------- Ağcayazı kəndi.
Qılıclı tayfası ------- Qılıclı kəndi və s.

Belə Türkdilli tayfaların və toponimlərin sayı Laçın rayonu ərazisində 100-dən çoxdur. "Belə etnooronimlərin mənşəyinin izah edilməsi ilə biz bir növ Azərbaycanın qədim əhalisinin etnik tərkibini və tarixini, Azərbaycan xalqının soy kökünü öyrənmiş oluruq. Laçın rayonunda yerləşən Abdal dağı, Abdal dərəsi, Abdal təpəsi oroqrafiq obyektləri etnonimlə bağlı olan oronimlərdəndir.....

1588-ci ilə aid olan mənbədə Qarabağ düzündə Həsən Abdallı elinin yaşadığı da göstərilir. Abadel/abdal tayfasını akademik V.V. Bartold Hun tayfası hesab edir. A.A. Bakıxanov da Abdal adlı tayfanın hələ çox-çox əvvəllər Azərbaycanda yaşamasını qeyd etmişdir. Türkiyədə, Başqırdıstanda,

Qazağıstanda, Türkmənistanda, Qırğızıstanda və Özbəkistanda (Qaraqalpaq) da Abdal adlı oykonim və oronimlər mövcuddur. ” (41,18.)

Verilmiş sitatdan bir daha aydın olur ki, qədim və ortaq Türk adları Laçın rayonuna aid onomastik vahidlərin əsasını təşkil edir.

Laçın rayonu ərazisində qeydə alınmış ortaq Türk adları sırasında Həkəri çayının adı daha önəm daşıyır. Belə ki, bu ad İranda, Türkiyədə, Azərbaycanda və Tacikistanda da qeydə alınmışdır. Ortaq Türk adları içərisində geniş yayılan vahiddir. “Uzunluğu 129 km-dir. Bu çayın adı indiyə qədər həm coğrafi, həm də digər mənbələrdə isə Akarlu, Ankara, Akeri kimi qeyd olunur. Bizə görə, bu çayın adı Türkiyədəki Həkəri mahalının adından götürülmüşdür. Qədim mənbələrdə bu çayın adı Aqvan−Alban şəklində qeyd edilmişdir. Çayın əsl adının Həkəri olması haqqında bəzi subutlar da vardır. Qubadlı rayonu ərazisində Həkərli adda kənd olmuşdur. Bu, vaxtilə buraya Həkəri qəbilələrinin köçüb gəlməsi, kənd salması, bu yeri isə öz tayfalarının şərəfinə adlandırması fikrini söyləməyə əsas verə bilər.”(30, 44.)

Həmçinin XVI−XVII əsrlərdə də bu çayın adının Həkəri olduğunu o dövrdə Laçın rayonunda yaşayıb yaratmış bayatı ustası Sarı Aşiq də bayatılarının birində belə vurğulayır:

Mən Aşiq, ha Kərim
Dada yetiş, ha Kərim
Sənə, sənin gen dünyan
Mənə, mənim Həkərim.

Deyilənə görə Sarı Aşiq İran Hökmdarından saraya dəvət alır və cavabında həmin bayatını söyləyir. Burada Həkərim dedikdə şair açıq aydın elim, obam, ulusum demişdir. Demək, XVI−XVII əsrlərdə Həkəri eli var imiş.

Laçın rayonu ərazisində ortaq Türk adlarının çoxluğu bu diyarın Türk dünyasının bir parçası olduğunu sübut edir.

# Ağoğlan qəsri




Bu tarixi abidə haqqında müxtəlif əfsanələr söylənilir. Deyilənə görə Ağoğlan adlı bir nəfərin tikdirdiyi qəsri xalq onun şərəfinə "Ağoğlan qəsri" adlandırmışdır. Lakin bu bir əfsanə olaraq qalır. Çünki qəsr Alban dövrünün yadigarıdır. "Ağoğlan" adı isə xalq mifologiyasının yaradıcılıq süzgəcindən süzülən və tarixin daş yaddaşına hopan bir onqondur.

Bu inanc xalq nağılımızın qəhrəmanı Ağ atlı oğlan, Ağ aşıq , Ağ atlı Xızır, Xızır Ilyas, Ağbulaq, Ağsu və və s. bu kimi adlarda ağ sözünün xeyir gətirən inam mənbəyi olması anlamını formalaşdırıb.

Ağoğlan qəsri Laçın rayonunda qeydə alınmış ən qədim abidədir. "V-VI əsrlərə aid alban monastırı olan "Ağoğlan" məbədi (İNV N310) Laçın rayonu ərazisində, Ağoğlan çayının sahilində yerləşir. Tarixi abidə əvvəllər qəsr olmuş, lakin müxtəlif dövrlərdə dağıntılara məruz qaldığından IX əsrdə kilsə üslubunda yenidən inşa edilərək monastır formasına salınmışdır". Ağsaqqal babalar, ağbirçək nənələr Ağoğlan qəsri haqqında belə söyləyirlər ki, bu yerlərə bir igid oğlan gəlir. Kosalar kəndi ərazisində olan qəsri tikməyə başlayır. Qəsrin tikintisində işləyənlərə yemək çəkilməsi zamanı bir qaranquş özünü ora-bura çırpır və qazandan yemək çəkilməsinə imkan vermir. Heç kim quşun bu hərəkətini anlaya bilmir və qaranquşu qovmağa çalışırlar. Lakin qaranquş özünü yemək qazanının içinə atıb öldürür. Sanki özünü şəhid edir. Bunu görən adamlar bişirilmiş yeməyi yerə tökməyi məsləhət edirlər. Bişmiş qazandan yerə töküldükdə görürlər ki,

qazanın içinə zəhərli bir ilan düşübmüş. Hamı qaranquşun nə üçün özünü şəhid etdiyini anlayırlar. Qaranquşu təntənəli şəkildə dəfn edirlər. Bu hadisəyə görə tikilmiş qəsri “Qaranquş qəsri” adlandırırlar. Lakin sonralar qəsri tikən xeyirxah insanın şərəfinə “Ağoğlan qəsri” adlandırırlar.

Təbiətə, təbiətin yaratdığı varlıqlara bəşər övladının tapınması obyektiv reallıq və təbii prosesdir. Odur ki, xalqımızın müxtəlif varlıqları onqon sayması, ona tapınması və bu gün də həmin anlamları yaşatmaları mifologiyamızın dərin qatlarından xəbər verir. Xalqımızın tapındığı varlıqlardan biri də quş onqonudur. Quş onqonları Azərbaycan onomastikasında bu gün də öz izlərini qoruyub saxlamışdır. Bu izləri biz yer adlarında və şəxs adlarında görə bilərik.

Yer adları: Laçın, Quşçu, Tovuz, Kəlbəcər, Toğana, Tər-tər və s.

Şəxs adları: Laçın, Tovuz, Şahin, Durna, Bülbül, Göyərçin, Səməndər, Turac, Kəklik, Əkil, Bəkil, Simurq, Humay, Toğrul, Zümrüd və s.

Beləliklə, xalq tikilmiş qəsrə mücdə rəmzi olan qaranquş adını verməsi heç də təsadüfü deyildir.

Çünki bu ərazidə ən qədim abidə Ağoğlan qəsridir. Sonralar abidənin gerçəklik, doğruluq, reallıq olduğunu bildirmək üçün “Ağ” sözündən istifadə etmişlər. Həmçinin insan arzusu ilə insan oğlunun yaratdığı bir abidə olduğunu bildirmək üçün “oğlan” sözünü ora əlavə edir, “Ağoğlan qəsri” adlandırmışlar.

“Ağ” sözü ucalıq, alilik, soy kökü kimi anlamlarında işlənmişdir. Xalqımızın tarixi mənəviyyat muzeyi sayılan “Dədə Qorqud” dastanında Qazan bəy öz soyunu, öz kökünü belə bildirir:

Ağ qayanan qaplanının erkəyində bir köküm var,
Ortac qırda sizin keyikləriniz durğurmaya.
Ağ sazın aslanında bir köküm var,
Qaz alaca yündünü durğurmaya,
Ağ sunqur quşu erkəyində bir köküm var,

Ala ördək, qara qazın uçurtmaya (26,114)

Göründüyü kimi Qazan bəy öz soyunun ulu, müqəddəs olduğunu bildirmək üçün ağ sözündən istifadə etməklə ağ qayanı, ağ sazı, ağ sunqur quşunun müqəddəsliyini diqqətə çatdırmışdır. Ağ sözü isə gerçəklik, ucalıq, alilik anlamında işlənmişdir. Məsələn, dilimizdə işlənən "ağ yalan" ifadəsində "ağ" sözü doğru, gerçək anlamını verir, yəni doğru yalan, gerçək yalan mənasında işlənir. Olmuş iş haqqında yalan danışmaq ağ yalan sayılmır, bu doğrunu inkar etmək, yalan danışmaq sayılır, amma olmamış, hətta həyatda mümkün olmayan bir iş haqqında söylənmiş yalan "ağ yalan" adlandırılır.

Buna "xalis yalan" da demək olar. Bəzən belə deyilir ki, (ağ eləmisən.) Bu o deməkdir ki, bəlli, aşikar edib, gerçəkləmişsən.

Yenə də ağ sözü doğruluq, gerçəklik anlamını verir. buradan belə bir nəticəyə gəlmək olar ki, xalq yaratdığı tarixi abidənin adını "Quş qəsri" deyil, həqiqətən, doğrudan da "Oğlan qəsri" olduğunu sübut etmək üçün oğlan sözünə "ağ" təyinedici sözünü əlavə edib "Ağoğlan qəsri" ifadəsini yaratmışdır. Xalq abidəni yaratdığı kimi onun adını da süzgəcdən keçirib formalaşdırmışdır

## Ərikli oykonimi yaddaşlarda

İlk baxışda ərik bağları çox olan yer kimi diqqəti cəlb edir, lakin belə deyildir. Bu ərazinin iqlim şəraitinin sərtliyi imkan vermir ki, ərik, tut, nar və s. soyuğa davamsız meyvələr yetişsin. Odur ki, bu kəndin adı burada yaşayan ər və yaxud ərk tayfalarının adı ilə bağlı formalaşıbdır. Xalq etimologiyasına əsasən bu kəndin adı Əlikli olubdu. Ruslar Arikli/ Orikli demiş, sonralar isə uğursuz tərcümənin nəticəsi kimi və yaxud qəsdən məqsədli şəkildə Ərikli kimi qeydə alınmışdır. Burada da sovetlər dövrünün yanlış damğası öz işini görmüşdür. Qurdqajı kəndinin

adı da rusca Kurtqadji deyilmiş, tərcümə olunanda isə Kürdhacı kimi qeydə alınmışdır. Bir məqama diqqət yetirmək lazımdır ki, qurd sözünə ruslar “kurt”, kürd sözünə isə “kyurt” deyirlər. Lakin məqsədli şəkildə qurdu kürd kimi təqdim edirlər ki, bu da sovet imperiyasının parçala hökm et ideologiyasına söykənən erməni siyasətinin bir variantıdır. Qurdqajı kəndində bir nəfər də olsun milliyətcə kürd olan yoxdur. Bu kənddə anadan olmuş Paşa bəy və oğlanları (Sultan bəy, İsgəndər bəy, Xosrov bəy, Rüstəm bəy, İsrafil bəy, Zülü bəy, Bahadur bəy) milliyətcə Azəri türkləridirlər. Həmin nəslin davamçısı kimi mən də türk olmağımla fəxr edirəm. Hər bir millət öz milli mənsubiyyəti ilə fəxr edə bilər. Ona görə də atalar gözəl demişdir: “Əslin danan haramzadədir”

Ərikli kəndinin tarixi, əhalisi, kəndin mədəniyyəti, təbiəti, əhalinin ictimai həyatı və məşğuliyyəti barədə geniş və əhatəli məlumatları Sultan Hümbətov Gülmalı oğlunun “Laçın yurdu” (ədəbi-bədii publisistik dərgi) jurnalında dərc olunmuş, “O kənd bizim kəndimizdir” başlığı altında verilmiş “Ərikli kəndi” məqaləsindən öyrənə bilərlər.

Ərikli kəndi rayon mərkəzindən 60 km. şimal qərbdə, Qarabağ silisiləsinin cənub qərb yamacındadır. Əhalisi 800 nəfərdir. Orta məktəb, kitabxana, tibb məntəqəsi, çörəkbişirmə sexi və mağazası var idi.

Bu kəndin adı Sisian rayonunda olan Ərikli kəndinin, Sisian rayonunu ermənistandan ayıran silsilə Ərikli dağlarının və Ərikli çayının adından götürülmüşdür. Ərikli sözünün leksik anlamı ərənlər, igidlər yaşayan məkan mənasındadır. Ərikli kəndi Sisian rayonunda olmuşdur. Bütün əhalisi azərbaycanlılardan ibarət olduğuna görə ermənilər həmin kəndin əhalisini pərən-pərən salmış və kəndi yandırmışlar. Laçın rayonunun Ərikli kəndi də həmin kəndin adını yaşadır. Sisiandan gəlmiş əriklilər az bir tayfa olmuş və çoxluq içərisində ərimişlər.

## Kəndin qan yaddaşı, şəhidlik zirvəsinin fatehləri

1. **Şahin Əli oğlu Abbasov(1951-1992)**
2. **Sədaqət Kamran qızı Abbasova(1961-1992)**
3. **Səadət Şahin qızı Abbasova(1980-1992)**
4. **Hüseyn İsmayıl oğlu Hüseynov(1934-1992)**
5. **Əzizə Alış qızı Hüseynova(1950-1992)**
6. **Xoşbəxt Hüseyn qızı Hüseynova(1963-1992)**
7. **Süsən Hüseyn qızı Hüseynova(1971-1992)**
8. **Zöhrab Hüseyn oğlu Hüseynov(1973-1992)**
9. **Nəsibə Hüseyn qızı Hüseynova(1980-1992)**
10. **Vahid Qara oğlu Sevindikov(1934-1991)**
11. **Yaşar Vahid oğlu Sevindikov(1970-1992)**
12. **Ərşad Qara oğlu Sevindikov(1935-1992)**
13. **Məcnun Zaman oğlu Zamanov.(1967-1992)**
14. **Çingiz Allahverdi oğlu Şükürov(1973-1994)**
15. **Fazil Azay oğlu Abdullayev(1958-1992)**
16. **Şirin Səməd oğlu Şirinov(1940-1990)**
17. **Güldəstə Qiyas qızı Ağamalıyeva (1940-1992)**

Ərikli kəndi ərazisində üç qədim tarixi abidə və çoxlu qəbirüstü abidələr, kitabələr vardır. Qurrdqajı kəndi ilə Ərikli kəndinin sərhəddində böyük bir Alban abidəsi vardır. O biri abidə isə Qarasaqal kəndində idi. Üçüncü abidə isə Kiş dağının sinəsində yerləşirdi və ona «Vəng» deyirdilər. Babam söyləyirdi ki, eşitdiyimə görə «Vəng»də zəyərəkdən yağ istehsal edirmişlər. Xalq arasında --- “Zərb zəyərəkdən yağ çıxarar”--- deyirlər.

Burada maraq doğuran adlardan biri də Kiş dağıdır. Şəki ərazisində Kiş kəndi, Kiş çayı vardır. Bu adın anlamı qədim minilliklərdən soraq verir. Belə ki, bu gün də dilimizdə «kiş-kiş» deyə işlətdiyimiz söz hər hansı şər qüvvəni qovlamaq məqsədilə işlədilir. Belə ehtimal olunur ki, bu dağ (Kiş dağı) şər qüvvələri qovmaq üçün seçilmiş məkandır və orada kilsə də tikiblər. Hətta xalq arasında Lola Bağır haqqında söylənilən rəvayət fikrimizi bir daha təsdiqləyir ki, bu da şər qüvvələri, ümumiyyətlə, dərdi-səri

qovmaq üçün seçilmiş bir yerdir. Belə nəql edirlər ki, Bağır adlı bir kişinin yeganə varisi olan oğlu ölür. Bağır kişi öz dərdini ovundurmaq və qəmini dağıtmaq üçün Kiş dağına çıxarmış. Kiş dağının zirvəsindən Bağır kişi lola (bayatı, ağı-Ə.Ə.) çağırarmış. Bağırın o qədər uca səsi varmış ki, ətraf kəndlərin adamları onun səsini uzaq məsafədən eşidərmişlər. Odur ki, xalq arasında bu kişiyə Lola Bağır deyərmişlər. Onun yaşadığı kənd bu gün də Lolabağırlı adlanır.

Kiş (xalq arasında bu dağa Keş dağı da deyirdilər) adı tarixin əski çağlarında Qədim Ikiçayarası Şumer mədəniyyəti dövründə formalaşmışdır: “Şumerlər Ikiçayarasının sakinləri idi. Onlar burada e.ə IV minillikdə məskunlaşmışdılar. Son vaxtlar Şumer dilində çoxlu türk mənşəli sözlərin
olduğu aşkarlanıb. Onların mənşəyi və dini haqda çoxlu fərziyyələr mövcuddur. Lakin məlumdur ki, Şumerlər əvvəlcə Ikiçayarasının cənubuna gəlmiş, Eredi şəhərində məskunlaşmış, tədricən bu əraziyə yayılmış və yerli əhali ilə qaynayıb-qarışmışdır. Şumer şəhər dövlətləri e.ə. III minilliyin birinci yarısında meydana gəlmişdir. Şumerdə mövcud olmuş dövlətlər sülalələrin adı ilə tanınırdı. Bunlardan birincisi Kiş sülalə dövlətidir. Bu sülalənin sonuncu hökmdarı Etana haqqında çoxlu əfsanələr mövcuddur. Kişdən sonra Uruq şəhər dövlətinin yüksəlişi başlanmışdır”. (8,5)

Burada diqqəti cəlb edən Kiş sülaləsidir. Bü sülalənin adı Laçın rayonunda Kiş dağının, Şəkidə Kiş kəndinin və Kiş çayının adlarında özünü qoruyub saxlamış və 6 min illik tarixi yaddaşı təsdiq edən sənəd kimi tarixin möhür eksponatına çevrilmişdir. Odur ki, biz Laçın ərazisində əcdadlarımızın 6 min illik bir tarixə malik olmuş e.ə. IV minillikdə bu ərazilərin sahibi olmasının şahidi oluruq.

# İgidlik soydan gəlir



Sultan bəy anadan doğulanda atası Paşa bəyə muştuluğa gedənə Paşa bəy heç nə verməyib və deyib ki, nə zaman o oğul olduğunu sübut edərsə, onda muştuluq verərəm. Nəhayət, bir gün Paşa bəyə xəbər çatır ki, Sultan bəy erməni quldurlarını məhv edib, onlar üzərində qələbə çalıb. Paşa bəy Sultan bəy doğulanda muştuluğa gələn adamı çağırtdırıb ona çoxlu hədiyyələr verir və deyir ki, oğul var ki, qız ondan yaxşıdır. Oğul var ki, əsil oğuldur, düşmən çəpəridir. Sultan bəy düşmən çəpəridir, şir ürəklidir.

Qaraqasımlı tayfasından olan Sultan bəyin nəsli Qasım uşağı adlanır. Bu tayfa Təkə-Türkmən mahalından İrana gəlmiş, oradan isə Qarabağa köçmüş və Laçında məskunlaşmışlar. Qasımuşağı adlanan tayfaya aid olan əhali Laçın rayonunun Ələkçi, Narzan(Nağdalı), Şamkənd, Yuxarı Çorman, Qurdqajı və Ərikli kəndlərində yaşayırdılar. İgidlik və cəsurluq bu camaatın irsi, xarakterik əlaməti idi. Hər bir fəaliyyət sahəsində bu camaatın içərisindən seçilib sayılan və qonşu kəndlərdə adı fəxrlə çəkilən bacarıqlı gənclərə rast gəlinirdi.Sultan bəyin cəsurluğunu yaşadan igidlərimiz bu gün də az deyildir. Qarabağ savaşında şəhid olan 266 nəfər laçınlıların 57 nəfəri Sultan bəyin nəsil şəcərəsinə daxil olan Qasımuşağı adlanan nəsildəndir. Həmçinin onlardan iki nəfəri - Novruzov Ələsgər Xanlar oğlu və Mehdiyev Fazil Umud oğlu Azərbaycanın Milli Qəhrəmanı adına layiq

görülüblər. Odur ki, "İgidlik soydan gəlir" kəlamı təsadüfi deyilməmişdir.

Bu tayfa Təkə-Türkmandan gəlibdir, "Təkəli" və yaxud "Türkman" tayfası adlanırlar. "Təkəlilər—qızılbaş tayfalarından biri—Təkətükman tayfasının bir qolu olan Təkəlilər cənubi Azərbaycanda və Kiçik Asiyada köçəri həyat sürürdülər. Səfəvilər dövlətinin siyasi həyatında mühüm rol oynayan Təkəlilərin bir hissəsi sonralar mərkəzi hakimiyyətə qarşı çıxdıqlarına görə 1596-cı ildə I Şah Abbas tərəfindən məhv edilmiş, qalanları Azərbaycanın müxtəlif yerlərinə yayılmışlar". (5,244)

"Türkmanlar, Türkmənlər—azərbaycanlıların etnogenezində iştirak etmiş türkdilli tayfadır. Səlcuqların tərkibində İrana, Azərbaycana və Kiçik Asiyaya gəlmişlər. Azərbaycanın və İranın siyasi həyatında mühüm rol oynamış Türkmanlar, ağqoyunlulardan ayrılaraq qızılbaş tayfa birliyinin tərkibinə daxil olmuş və Səfəvilər dövlətinin yaranmasında iştirak etmişlər." (5,402.)

Bu faktlardan tam aydın olur ki, Sultan bəy nəsli dərin köklərə bağlıdır və onun igidlik, cəsurluq tarixi ulu əcdadlardan bu günə qədər keçib gələn genoloji atributdur. Bunu XVI əsrdəki Cəlalilər üsyanının başçısı, tarixi şəxsiyyət olan Koroğlu tımsalında da görə bilərik. "Tarixi ədəbiyyatda Koroğlunun tarixi şəxsiyyət olduğunu ilk dəfə qeyd edən İ.P.Petruşevski olmuşdur. "Koroğlu" dastanında adları çəkilən qəhrəmanların da bir çoxu tarixi şəxsiyyətlərdir. Koroğlunun yaxın silahdaşları Dəli Həsən, Giziroğlu Mustafa bəy, Kosa Səfər və Tanrıtanımaz tarixi qaynaqlarda cəlalilərin geniş şöhrətə malik rəhbərləri arasında yad edilir." (4,273.)

Koroğlu öz tayfasını və haralı olmasını belə söyləyir:

Muradbəyli derlər bizə
Meydanda mərdlik işləni....
Ərəb paşa, sənə bir ərz eyləyim,
Yerim xəbər alsam, Muradbəyliyəm.

Muradbəyli indiki Ağdam rayonundakı Muradbəyli kəndidir. Məşhur el kəlamında deyilən ("Hər oxuyan Molla Pənah, hər qatırçı Murad olmaz") Muradın adı ilə bu kənd Muradbəyli adlanıbdır.

Murad bəyin nəvəsi Qara bəy Paşa bəyin qızı Ziba xanımla evlənibmiş.

Dastanda Aşıq Cünun da doğulduğu obanı söyləyir:

Arasbar tərlanıyam
Sonalar Təklədənəm.

Ağcabədi rayonunun Arasbar kəndinin yaxınlığında Təklə kəndi olmuşdur.

"Nəhayət, Koroğlunun və Nigar xanımın övlad həsrətinə çarə tapan da, məhz, Aşıq Cünun olur. O, gənclik illərindən də yaxşı tanıdığı (ərazicə yaxın olduğu) Təkə-Türkmən obasına gəlir. Burada qəssab Alının oğlu gənc Eyvazı yüz igidin içindən seçib bəyənir. Və onu Koroğluya, Nigar xanıma layiq oğul bilir. Təkə-Türkmən kəndi də uzaqda deyildi. Muradbəyli və Arasbarın cəmi bir neçə kilometrliyində yerləşirdi. Araşdırmamız göstərir ki, XVI əsrdəki Təkə-Türkmən Bərdənin indiki Türkmən kəndidir. XX əsrin əvvəllərinədək bu kəndin Təkə, yaxud Təklə tirəsi də olmuşdur.

Deməli, Koroğlu—indiki Ağdamın Muradbəyli, Eyvaz—Bərdənin Türkmən, Aşıq Cünün isə—Ağcabədinin Arasbar kəndlərində dünyaya gəliblərmiş." (23,62)

Buradan bir daha aydın olur ki, Sultan bəyin ulu babaları, Təkə-Türkmanlılar, Təkəlilər Cəlalilər üsyanının iştirakçıları, başçısı olmuşdur. Odur ki, igidlik soydan gəlir ifadəsi öz təsdiqini bir daha sübut edir. (24,67)

## Tarixiləşən adət-ənənələrimiz və dilimizin tarixini yaşadan sözlərimiz

Dünənimiz bu gün üçün bünövrə gələcək üçün zirvədir. Bünövrəni unutsaq, zirvəni fəth edə bilməyəcəyik. Dünəninə biganə baxanların gələcəyi yoxdur. Gələcək bu günə və keçmişə dirsəklənir. Ona görə də xalqımızın və milli soykökümüzün qədim tarixi milli adət-ənənələri vardır. Bu gün bəzi adət-ənənələrimiz unudulmaq üzrədir. Bunlar ona görə unudulmaq üzrədir ki, elmi-texniki yeniliklər həmin adət ənənələri muzeyləşdirib, sözlərini eksponat yaddaşa çevirib. Odur ki, həmin adət-ənənələri, onlara aid sözlərin məna anlamını unutmamaq üçün yaddaş süzgəcimdə olanları qələmə almağı lazım bildim. Aşağıda verilən məlumatlar həm gənc nəsil üçün , həm də ümumilikdə hər bir vətəndaş üçün lazımlı və aktualdır. Haqqında danışacağımız adət-ənənələrimiz, milli-mənəvi dəyərlərimiz, arxaik sözlərimiz dərsliklərdə öz əksini tapmalı və gənc nəslin hərtərəfli inkişafı, dünyagörüşünün mükəmməl formalaşması üçün tədris olunmalıdır. Bu bilgilər aşağıdakı sahələri əhatə edir:

1. Əkinçilik , maldarlıqla bağlı adət-ənənələr və onlara aid arxaik fonda keçən sözlərimiz.
2. Əyricilik və toxuculuqla bağlı bilgilər.
3. Novruz bayramı, toy mərasimi ilə bağlı adətlərimiz, sözlərimiz və deyimlərimiz.

## 1. Əkinçiliklə, maldarlıqla bağlı adət-ənənələr və onlara aid arxaik fonda keçən sözlərimiz.

Qədim zamanlarda babalarımız əkin-biçinlə məşğul olan zaman yeri çətinliklə də olsa şumlayırmışlar. Yeri şumlayan kişilərə şum ərləri deyirmişlər.Bu da ən qədim əcdadlarımız olan, e.ə. vı minillikdə yaşamış Şumərlərdir. (Şumer) Yeri cütlə, xışla, kotanla şumlayırmışlar. Bu prosesdə öküz əsas qüvvə olduğu üçün çörəyə "öküz əməyi" deyirmişlər. Yeri şumlamaq üçün üç cüt öküz qoşa-qoşa kotana qoşularmış. Kotana birinci qoşulan cütlüyə (öküzə) "ambul öküz", ikinci qoşulana "qaraqayış", üçüncü cütlüyə isə "qabaq öküzü" deyirdilər. Kotanla boyunduruğu birləşdirən üç dirsəkli ağaca "masan", boyunduruqla masanı birləşdirənə "həvəndə" deyilirdi. Həvəndə göndən hazırlanmış köşədən toxunarmış. Kotanı tutmaq üçün iki qolu var imiş, həmin qollara "maj", majdan tutub öküzü idarə edənə "hodaq" deyirlərmiş. Kotana üç boyun öküz qoşulduğuna görə onları idarə etmək üçün üç hodaq lazım olurmuş. Yer şumlandıqdan sonra taxıl səpilir, malalanır və yazın axırıncı ayında və yaxud yayın birinci ayında biçinçilər oraqla, çinlə taxılı biçirmişlər. Biçilmiş taxıl dərz tayalarına vurulur və sonra döyülmək üçün öküz arabaları ilə xırmanlara daşınardı. Xırmanda taxıl hazırlanıb üyüdülmək üçün dəyirmana yol alardı. Bu proseslərin hər birinin özünəməxsus iş üsulu, qaydası və hər bir üsulun, qaydanın özünəməxsus sözü, deyim forması vardır. Odur ki, aşağıda verilmiş izahlı lüğət həmin adət-ənənənin, sözlərin, müəyyən deyim və duyumların unudulmaması üçün bilgi verir.

**Bəzi arxaik sözlərin izahlı lüğəti və bu anlamların xalq yaradıcılığında əks olunması.**

Cütcü – cütlə yer şumlayan şəxs.

Cüt – yeri şumlamaq üçün ağac kotan.

Xış – ağac kotan.

Kotan – dəmirdən hazırlanmış və şumlamaq üçün qurğu.

Sirpic – kotanın palçığını təmizləmək üçün istifadə olunan ağac.

Masan – kotanla boyunduruğu birləşdirən üç dirsəkli ağac.

Həvəndə – boyunduruqla masanı birləşdirən vasitə, köşədən toxunarmış.

Ambul öküz – kotana qoşulan birinci öküz cütlüyünə deyilir.

Qaraqayış öküz – kotana qoşulan ikinci öküz cütlüyünə deyilir.

Qabaq öküzü – kotana qoşulan üçüncü öküz cütlüyünə deyilir.

Maj – kotanın, xışın, cütün qollarına, tutacağına deyilir.

Majgal – majdan tutan adam.

Boyunduruq – iki öküzün boynuna taxılır, vəli ona qoşurlar.

Samı – boyunduruğu öküzün boynuna bağlayan ağac vasitə.

Samı bağı – samının aşağı uclarını öküzün boynuna bağlayan ip, bağ.

Hodaq – boyunduruqda oturub öküzləri idarə edən.

Bir boyun öküz – boyunduruğa qoşulan bir cüt öküz.

Qamçı – qırmanc da deyilir, öküzləri vurmaq üçün göndən hazırlanır.

Oraq – taxılı biçmək üçün aypara şəkilli alət.

Çin – oraqdan bir az balaca aypara aləti.

Dərz – iki bağ taxıl.

Taya – üst-üstə yığılmış dərz koması.

Xırman – taxılı döymək üçün xırı çox olan sahə.

Vəl – taxılı döymək üçün xırmanda öküzə qoşulan enli taxta. Altı daşla dişlənir.

Şadara – iri gözlü xəlbir.

Xəlbir – taxılı ələyib zibilini təmizləmə vasitəsi.

Kürəkəş – xırmanda taxılı kürümək üçün ağac vasitə, alət.

Kövşən – taxıl zəmisi.

Saman – sünbülün aşağı hissəsi.

Bafa – bir əlin içi tutduqca yığılmış sünbül.

Bağ – üç, dörd bafaya deyilir.

Bəlim – bir az döyülən taxılın küləşi.

Bəndəm – dərzi bağlamaq üçün istifadə olunan uzun ot.

Pencə - on dərzə bir pencə deyirmişlər.

Qırppa – buğdanı sünbüldən qoparmaq. Qırppanı ütüb, sütül edib, ovub yeyərmişlər.

Şana – ağac yaba.

Mərək – ot, saman, dərz yığılan yer.

Dəyirman – taxıl üyüdülən sistem.

Dəhnə – suyun arxa buraxılma mənbəyi.

Təhnə – dən tökülən ağac qab.

Çax-çax – dənliyi tərpətməklə dənin tökülməsini nizamlayır.

Dəyirmanın dabanı – dəyirmanın sürətini nizamlayır.

Donuzluq – dəyirmanın pəri, çarxı olan yerə deyilir.

Dəyirmanın suvadı – dəyirmanı işə salmaq üçün sonuncu su ayrıcı.

Dənlik – təhnədən tökülən dəni dəyirman daşının boğazına yönəldən dən yolu.

Ard – dəyirmanın daşının çevrəsi boyunca toplanan ən narın, tozlanmış un yığımı.

Buxarı – dəyirmanın divarında qalanmış ocağın tüstü yolu.

Buxarının badı – buxarının yan divarındakı daş.

Fətir – buxarının badında bişirilən duzsuz çörək.

Dağar – keçi dərisindən hazırlanmış, tüklü üzü içəridə olan kisə.

Çuval – 100, 150 kq. un tutan kisə, (meşok)

Dəyirman daşının dişlənməsi – üst daş arxası üstə yerə qoyularaq dəmir zubillə daşda xüsusi dişlər düzəldilir ki, buna daşın dişlənməsi deyilir.

Şaad – alınan dəyirman haqqı.

Yağır öküz – boynu yara olan, (üstü açılmış yara) öküz.

Sağır öküz – sahibsiz, yetim.

Kürək – taxılı kürümək üçün ağac alət, sanki ağac bel.

Lağərək – kotan tutmayan əkin yeri.

Qop – kiçik ot tayası, buna qop da deyilir.

Savırıx – xırmanda döyülmüş dəni küləyə verib samandan ayırmaq.

Kərdiyar – dənli bitkilərin qarışığına deyilir.

Xərək – şumun içində əkilməyən sahə.

Peşqurd – taxılın ilk nübarına deyilir.

Zəyərək – dənli bitki növü (zərb zəyərəkdən yağ çıxarar).

Köşə - göndən hazırlanmış (şırım), çəkilmiş ip.

Toxa – torpağı yumşaltmaq üçün alət-qədim zamanlarda torpağı əkmək üçün istifadə edirmişlər.

Kiriş – köşənin burulmuş, tavlanmış forması.

Küləş – xırmana tökülən buğdanın döyülməmiş hissəsi.

## Arxaik sözlər poetik deyimlərdə

Bir sıra arxaik sözlər xalq deyimlərində şairlərin yaradıcılığında poetik dillə ifadə olunmuşdur. Belə sözlərə ən çox holavarlarda, sayaçı sözlərdə, bayatılarda və s. rast gəlmək olar:

Cütcü.
Çıxdı Günəş, doldu cahan nur ilə,
**Cütcü** sürür tarlada **cüt** şur ilə,
Atlar, öküzlər kotana güc vurur.
Gah yürüyür, gah yıxılır, gah durur.

M.Ə.Sabir

Öküzlər qoşa getdi,
Güc vurdu, daşa getdi.
**Cütün majı** qırıldı,
Zəhmətin boşa getdi.

Öküz qıyar canını,
Bilməz **qamçı** sayını.
**Qayış** çəkən qaşqa kəl,
Iş üstündə tanını.

("Kotan nə bilir, qayış nə çəkir.")

Qızıl öküzüm yeri,
Qoyma **şum** qala geri,
Iti tərpən, maralım,
Düşmənlər baxır bəri.

**Kotanın hodaqları,**
Partlayıb dodaqları.
Qarğayın kotan sınsın,
Dincəlsin **hodaqları.**

**Kotanın hodaqları,**
Bar tutub dodaqları.
Qarğaram kotan sına,
Dağıla **hodaqları.**

**Qara kotan** ağırdır.
**Öküzlərim yağırdır.**
**Qarmax tellim** çəkməyir.
**Xınalım da sağırdır.**

Öküzlərim naz eylər,
Quyruq bular, toz eylər.
Hər axşam gün batanda,
**Kövşəndə** pərvaz eylər.

Qurd sürüdən pay salır.
Çoban dağa hay salır.
Öküz ax-vay deməkdən,
**Boyunduruq** vay salır. (cırıldayır.)

Mən aşiq **bafam** aldı.
Biçmədim **bafam** qaldı.
Car çəkdim cəfa çəkdim,
Özümə cəfam qaldı.

**Qaşıqaşı** bişirər,
Bilməz naşı bişirər.
Aşiq belə görübdü,

Ayaq başı bişirər.

(Yetişməmiş sütül sünbülü qırppa edərək, samanı odlayıb, orada ütüb, ovub yeməyə işarə olunur.)

**Buxarı qurum** saxlar,
Od yanar **qurumsu** ağlar.
Aşiq der; ər libasın,
Geyməsin qurumsaxlar.

**Dəyirmana** tökmə dən.
Üyütmədən, tökmədən.
Əgər xəbər versələr,
Gələr **cilov** çəkmədən.

Haray ellilər, haray!
**Şana tellilər** haray!
**Dəhnəni** sel aparıb,
Əli **bellilər** haray!

Haray elli neyləsin,
Şana telli neyləsin,
**Dəhnə** çürük çıxıbdı,
Əli **belli** neyləsin?!

## Ev heyvanları haqqında bilgilər

Kəndimizin camaatı və eləcə də qonşu kəndlərin əhalisinin əsas məşğuliyyəti heyvandarlıq təsərrüfatı idi. Əhali at, eşşək, inək, camış, qoyun keçi saxlayır və yaşayış tərzini özü nizamlayırdı. Bütün bu proseslər zamanı hər bir sahənin özünəməxsus sözləri vardır ki, bu gün həmin sözləri nəinki uşaqlarımız və gənclərimiz, hətta bir qrup yaşlı nəsildən olan adamlarımız da bilmirlər. Odur ki, belə sözlərimizin unudulmaması üçün mənə məlum olan bilgiləri qələmə aldım.

**At haqqında: deyimlər duyumlar, ümumiyyətlə, formalaşmış leksik ifadələr :**

At ayağı yüyürək olar, at muraddır, yuxuda at görmək arzuya yetmək deməkdir , atın yalına söyməzlər, at təpiyinə at dözər, atı atın yanında bağlayanda ya xofun götürər, ya xasiyyətin, atı atın yanında bağlayanda həmrəng olmasa da, həmxasiyyət olar, kor atın kor nalbəndi, çək belə bəndi çək elə bəndi, igid odur atdan düşə atlana , İgid odur hər əzaba qatlana, yaxşı at özünə qamçı vurdurmaz, ərsiz arvad yüyənsiz atdır.

Min Qazaxda köhlən ata,
Yalmanına yata-yata,
At qan-tərə bata- bata,
Göy yaylaqlar belinə qalx,
Kəpəz dağdan, Göygölə bax,
(S. Vurğun ).

Göy at yallaram səni,
Gümüş nallaram səni,
Məni dost a yetirsən,
Məxmər çullaram səni.

Atın yalının, quyruğunun və qəsdlə qırxılması tarixən at sahibinə sataşmaq kimi qiymətləndirilib, bir sözlə belə iş namus məsələsi dərəcəsində dəyərləndirilib.

Tarixi şəxsiyyətlərin adları tarixin yaddaşında əbədi qaldığı kimi, onların mindikləri atların adları da yaddaşlara həkk olunmuşdur. Makedoniyalı İsgəndərin atının adı Bitsival, İmam Əlinin atının adı Düldül, Koroğlunun atları Qırat, Dürat, Nəbinin atı Bozatdır və s

## Ata aid olan sözlərin lüğəti.

At - ümumi ad, minik və yük vasitəsi olan ev heyvanı.

Arqun – vəhşi ayqırla əhliləşmiş madyanın cütləşməsindən törəyən at cinsinə arkun deyilir.

Ayğır - minik vasitəsi kimi istifadə olunmayan erkək ata ayğır deyilir.

Bulaq – ala-bula atlara bulaq at deyilir, geniş sağrılı atlara da bulaq deyilir.

Baytal – Qırğızlar dişi ata baytal deyirlər.

Buruntax – atın burnunun üstündən dolanan ipə, buruntax deyilir

Buxov – atın ayağına vurulan dəmir alət. Kilidlənir və açarı atın sahibində olur. Atın qabaq əllərinə vurulur.

Cilov – atın başına geyindirilən və sürücünün sanki sükanı rolunu oynayır. Göndən hazırlanır. Bəzən buna yüyən də deyirlər.

Cıdır – at yarışı.

Cıdır düzü – at yarışı keçirilən yer.(Şuşada Cıdır düzü öz adı ilə məşhur idi.)

Çər – at xəstəliyi. At çərləyib ölür.

Çidar – atın qabaq əllərinə bağlanan ipə deyilir.

Çəpçidar – atın dal ayağını qabaq əli ilə bir-birinə bağlamağa deyilir.

Çortdax – Narahat at yerişi.

Çul – atın belinə atılan toxunma vasitə.

Çatı – atın başına bağlanan toxunma ip.

Dayça – bir illik atın balasına dayça deyilir.

Day – üçyaşar erkək at balasına day deyilir.

Dürat – duru, yəni su rəngində olan ata dürat deyilir.

Dördəmə qaçış – at qaçışı. Atın ayaqlarının 4-ü də qoşa-qoşa irəliləyir.

Dilboz – at cinsidir, onu yetişdirən tayfanın adından götürülmüşdür.

Doğanaq – örkən və cicimin ucuna taxılan xüsusi formaya malik, ağacdan hazırlanır, "Örkən nə qədər uzun olsa da doğanaqdan keçər" – deyiblər. Doğanaq vasitəsi ilə vurulan düyünə "təng etmək" deyilir.

Xam at – miniyə öyrədilməmiş at.

Xilə - türklər ala ata xela deyirlər.

Xurcun – yəhərin arxa tərəfinə aşırılan və iki gözü, yəni torbası olan vasitə. Xurcunu toxuyurlar.

Xunan – tatar və başqurdlar ikiyaşar ata "dünan", üçyaşar ata "qunan" deyirlər. Sibir türkləri 2-6 yaş arasındakı atları "kunan" adlandırırlar.

Köhlən – qaçaq , yorğa, iti yeriyən ata köhlən at deyilir.

Kürən – sarı rəngli ata kürən at deyilir.

Kəhər – tünd qırmızı rəngli ata kəhər at deyilir.

Kula – açıq sarı rəngli madyan ata qula deyilir. Mahmud Kaşğarlının "Divani-lüğətit-türk" əsərində zəfəran rəngində olan atlar kula adlanır.

Konqur – boğuq rəngdə, qonur rəngdə olan ata konqur deyilir.

Kurik – atın yeni doğulmuş balasına kurik deyilir.

Qarabaldır – baldırı qara rəngli at.

Qaraçallı – qara rəngli və ağ çilləri olan atlara deyilir.

Qusar – cavan madyana kuzarak deyilir, yəni qısır, doğmayan mənasında işlənir.

Qaşqay – alnında ağ zolağı olan atlar qaşqa adlanır. Belə atlara müxtəlif tarixi dönəmlərdə kaşka, qaşqay, kaska, kaskey demişlər.

Qulan – üçyaşar dişi ata qulan deyilir.

Qulun – yeni doğulmuş atın balasına kurik deməklə yanaşı qulun da deyilir.

Qaşov – atı tumarlayıb yuyan zaman istifadə olunan alət, təmizləmə vasitəsi.

Quşğun – atın quyruğunun kökünə keçirilən ip, quşğun atın yəhərini, palanını atın boynundan düşməmək üçün istifadə olunur.

Qancığa – yəhərin qaşından və tərkindən, yəni arxa tərəfindən bağlanmış, göndən hazırlanmış ipdir. Vəzifəsi hər hansı bir şeyi düşməsin deyə yəhərə bağlamaqdır.

Madyan – dişi ata madyan deyilir.

Noxta – atın başına geydirilən ipdən toxunmuş vasitə. Yüyən, cilov, göndən hazırlanır, noxta isə hörülmüş ipdən.

Nal – atın ayağına mıxla vurulan aypara şəkilli at geyimi, at ayaqqabısı.

Nalbənd – atı nallayan sənətkar.

Atı ifcin nallamaq – atın dörd ayağının dördünün də birdəfəyə nallanmasına deyilir.

Örkən – yer hanasında toxunan eni 10 sm olan ip.

Palan – atın belinə qoyulub yük daşıma üçün istifadə olunan vasitə.

Palançı – palan hazırlayan sənətkar.

Palanduz – palanı tikmək üçün istifadə olunan alət.

Rəşmə - atın başına bağlamaq üçün toxunan ala-bula ip.

Səkil – ayağı ağ rəngdə olan ata səkil at deyilir.

Sakqov – at xəstəliyidir. Bu xəstəliyə tutulan atı minib, qovhaqovla çapıb tərlətdikdə bəzən atın xəstəliyi sağalır, yəni atın nəfəs yollarını tutmuş çirk təmizlənir. Bu işi hər adam yerinə yetirə bilməz. At minməkdə məşhur olan sak tayfaları at minməkdə mahir olduqları üçün və bu işin ustası olduqları üçün, məncə, belə demişlər ki, "sak atı min qov," sonralar bu ifadə "sakqov" şəklində formalaşmışdır. Sakqov xəstəliyinə tutulmuş atları son zamanlarda andız bitkisi ilə müalicə edirlər.

Sicim – saç kimi hörülmüş ip., 10-15 metr uzunluğunda olur, boir ucuna da doğanaq taxılır. Yundan hazırlanmış ipdən və keçi tükündən də hazırlanmış ipdən hörülürdü. Keçi tükündən hazırlanmış sicimə "qıl sicim" deyilirdi.

Səmənd at – açıq sarı rəngli ata səmənd at deyilirdi.

Şallaq – at sürmək üçün istifadə olunan qırmanc, göndən çəkilmiş köşədən hörülür.

Ürgə –

Üzəngi – yəhərin hər iki yanından sallanan və atı minən zaman ayaq qoyulan vasitə, atı minəndə ayaqlar üzəngiyə keçirilir.

Ürkməz – at növüdür, atın xarakterinə görə belə adlandırılır.

Yorğa at – rahat yerişli ata yorğa at deyilir.

Yəhər –atı minmək üçün atın belinə qoyulan əsləhəyə yəhər deyilir.

əsləhə - atın yəhəri, yüyəni (cilov), noxtası və s. vasitələrinə birlikdə at əsləhəsi deyilir.

Yüyən (cilov) – atın başına geyindirilən göndən hazırlanmış vasitə, sanki sürücünün sükanıdır.

Yortmaq - narahat at yerişi.

Yelpik at – ürəyi parok vəziyyətində olan , daim tövşüyən at. At xəstəliyinin bir növüdür.

Yal – atın boyun hissəsinin tili boyunca bitən saça atın yalı deyilir.

Yabı – pis yerişli, ölüntü, çortdax ata deyilir.

(Dindirir, dingildədir yabı məni,
Ya mən öldürəcəm, ya bu məni.)

At kırıltısı, fınxırtısı, kişnəməsi – atın çıxartdığı səslər.

Gümru – tatar dilində "kümrü" qonqar belli atlara deyilir.

At qulaqlarını şəkləyir, ayaqlarını cütləyir.

At gövşəyən heyvan deyildir, amma rəvayətə görə axır çərşənbə gecəsi at bir neçə dəfə gövşəyir. Bu anı qız görüb desə ki, Tanrı məni oğlan et, onda oğlan olar. Təbii ki bu bir rəvayətdir.

Atın yalının hörülməsi –

Eşşək (uzunqulaq) – yük üçün yararlı heyvandır.

Qoduq (xotuq) – eşşəyin yeni doğulmuş balası.

Spa – biryaşar eşşək balasına deyilir.

Qatır – atası eşşək, anası at olan heyvan.

(Tutdu, tutdu tubulğa
Tutdan bitdi tubulğa
Nə tutdu, nə tubulğa.) (Qatır.)

## İnək, camış, keçi ilə bağlı sözlərin lüğəti

Naxır – inək , camış sürüsünə naxır deyilir.
Axur – mala yem vermək üçün tövlədə hazırlanmış yer.
Sığır – türk dillərində inəyə sığır deyilir.
Buzov – inəyin yeni doğulmuş balasına deyilir.
Dana – biryaşar inək balası.
Buğa – iki-üç illik erkək inək balası.
Kələ – damazlıq buğa.
Gəzyazma – buğaya gəlməyən, bir il vaxtı keçən düyə.
Düyə – biryaşar dişi dana.
Balax – camışın yeni doğulmuş balası.
Kəlçə – biryaşar camış balası.
Qısır – doğmayan (amma sonra doğa bilər.)
Ərəmik – doğmayan (heç vaxt doğmayan)

Höyürə gəlmək – buğaya gəlmək. (Qeyd:İnsanlar öz ehtiyaclarını ödəmək və döl artırmaq üçün münasibətdə olurlar ki, buna cinsi əlaqə deyilir. Ildə bir dəfə döl vermək üçün heyvanlar arasında olan belə əlaqə isə ayrı-ayrı sözlərlə ifadə olunur. Hər bir heyvana məxsus adlandırılmış həmin sözlər bunlardır; at-eşşək dələfə, it-canavar kütə (kürsəyə), inək buğaya (höyürə), camış kələ, qoyun qoça, keçi təkəyə gəlir deyirlər. Bu baxımdan müxtəlif heyvanların çıxartdığı səslərin və onların balalarının adlarını da qeyd etmək önəmlidir:

1. Inək mələyir, dana böyürür, inəyin balasına buzov
2. Qoyun mələyir, balası quzu adlanır.
3. At kişnəyir, kırıldayır, fınxırır, balası qulun (kurik) adlanır.
4. It hürür, mırıldayır, balasına küçük deyilir.

5. Pişik miyoldayır, balasına mavrı deyilir.
6. Eşşək anqırır, balasına xotuq (qoduq) deyilir.
7. Camış anqırır, balasına balax deyilir.
8. Keçi bəyirir, balasına oxlaq deyilir.
9. Quş cikkildəyir, balası sərçə, quş balası adlanır.
10. Xoruz banlayır, balalamır.
11. Toyuq qıqqıldayır (quqquldayır), balası cücə adlanır.
12. Dəvə hökküldəyir, balası köşək adlanır.

Başqa bir anlama diqqət yetirsək:
Qoyun sürüsünə "sürü", dəvə sürüsünə "gəllah", at sürüsünə "ilxı", inək sürüsünə "naxır", camış sürüsünə "qara naxır", it sürüsünə "xıl" deyilir.
Kəl – damazlıq erkək camışa kəl deyilir.
Keçi – türk inamına görə ərvah sayılırmış.
Oxlaq – keçinin yeni doğulmuş balası.
Çəpiş – altı aylığından bir yaşa qədər keçinin balası çəpiş adlanır.
Təkə - keçinin bir yaşından sonra erkəyinə təkə deyilir.
Kolə (kölə) – buynuzsuz keçi.
Dıbır (dibir) – ikiyaşar erkək keçi.
Erkəc – qoyun sürüsünün önündə gedən çoxillik təkəyə deyilir.
Sibir – üçillik dağ təkəsi.
Lək – Qırğız dilində altı aylıq oğlaq lək adlanır.

Bəzən şivələrdə - mənim ailəm beş başdan ibarətdir – deyilir. Bu yanlış deyimdir. Çünki baş sözü heyvana aid ifadədir. Odur ki, baş, ədəd, nəfər, cüt, göz, qaşıq, metr, kq, sm, qənəd, kisə, çanaq, vedrə və s. kimi sözlər dilçilikdə numerativ sözlər adlanır. Belə sözlər müəyyən miqdar sayı ilə isimlər arasında işlənir. Lakin üç vedrə şüşə deyə bilmərik, çünki sözlər bir-birinə məna baxımından uyğunluqla bağlanmır. Təbii ki, üç vedrə su demək məntiqi cəhətdən doğru olar. Dialekt və şivələrimizdə belə qanunauyğunluqlar gözlənilmədiyindən bir sıra bilgiləri qeydə almağı lazım bildik: Heyvanlar başla, insan isə nəfərlə, cansız əşyalar ədədlə, qoşalıq bildirən əşyalar cütlə, göz, qaşıq, metr, kq, sm, qənd, kisə, çanaq, vedrə və s. kimi sözlər isə məntiqi məna

anlamına uyğun sözlə uyğunlaşıb uzlaşmasına əsasən işlədilir. Məsələn; üç ədəd qələm, üç cüt ayaqqabı, üç göz otaq, üç qaşıq dərman, üç metr parça, üç kq qənd, üç qənəd toyuq, üç kisə düyü, üç çanaq buğda, üç vedrə su və s. və i.a.

## 2.Əyiricilik və toxuculuqla bağlı bilgilər

Əyiricilik və toxuculuq yun məhsulu ilə bağlı olduğundan yunun hazırlanması prosesinə diqqət yetirmək lazımdı.

Qoyun qırxımı bir yazda, bir də payızda olur. Qoyunu qırxlıqla qırxırlar. Qoyunu qırxan zaman qırxımın vaxtını keçirsən, yəni gec qırxsan, qoyun qırxlığa düşüb ölərdi. Yazda qırxılan yuna "yapağı", payızda qırxılan yuna isə "güzəm" (küzəm) deyilirdi. Yundan yorğan və döşək hazırlanmasında istifadə etməklə bərabər toxuculuqda da geniş istifadə olunur. Ona görə də xalq öz deyimində bu fikri belə poetikləşdirmişdir:

Qoyunlu evlər gördüm,
Qurulu yaya bənzər.
Qoyunsuz evlər gördüm,
Qurumuş çaya bənzər.

Toxumaq üçün yunu hazırlamaq lazımdır. Əvvəlcə yun yuyulur, sərilib qurudulur, didilib pıtraqlanır, yəni zir-zibili təmizlənir, sonra isə xüsusi dəmir daraqlarda daranıb əlçimlənir. Əlçimlər cəhrə vasitəsi ilə əyrilib dükcələnir, dükcə kələflənir, ip kələf olan zaman boyanır, kələf yumaqlanıb yumağa çevrilir. (Vay o günə kələfin ucu itə.) Yumaqlar hananın küjü oxundan asılır və toxunur.

Hanaya aid hissələr bunlardər: hananın yan dirəkləri, alt və üst oxları, vərəngalan, küjü çubuğu, küjü oxu, kirkid, həvə, əriş, arğac, küjü ipi, ilmə, yançı, iməci, pəng, arğac üçün şülək.

Hana vasitəsi ilə palaz, gəbə, fərməş, xurcun, çul, taxta palaz, qaynaq palaz, açma-yumma palaz, kilim, ərəş kilim, açma-yumma gəbə, cejim, şəddə, zili, gül gəbə, qız gəbə, marallı gəbə, çələvird gəbə (çiləbörd) toxunur.

## İzahlı lüğət

Koy (xoy) – türk dillərində qoyun deməkdir.
Quzu – qoyunun balası.
Balbas – qızıl qoyun cinsi.
Bozax – qədim qoyun cinsi, bozumtul ağ rəngdə olurlar.
Qoç – erkək, damazlıq qoyun cinsi.
Sokar – buynuzsuz qoyun.
Kozman – yeddi yaşlı qoç.
Azman – beş yaşında olan erkəyə azman deyilir. Man Türk dillərində qoyun deməkdir.
Dızman – altı yaşlı qoç.
Toğlu – altı aydan bir yaşınadək toğlu adlanır.
Şişək – bir yaşlı dişi qoyun şişək adlanır.
Öyəç – iki illik qoç. Albanca "örgəç" deyilir.
Kərə - qulağı gödək qoyun.
Kürə - qulağı uzun qoyun.
Arxac – qoyun salınan yer.
Küz – quzunun payız saxlanma yeri. (Qoç quzu küzdə bəlli olar.)
Kəlin – buynuzlu qoyuna kəlin qoyun deyilir.
Qırxlıq – qoyunu qırxmaq üçün alət.
Yapağı – yaz yunu.
Güzəm – payız yunu.
Dəmir daraq – yunu daramaq üçün alət.
Əlçim – bir əlin içində olan yun.
Cəhrə – yunu əyirmək üçün qurğu.
Dükcə – cəhrənin iyində toplanmış ip.
Kələf – dizə doladılmış səkkiz rəqəmi formasında olan ip.
Yumaq – yumurulanaraq top kimi sarınmış ip.
Küjü – hananın ərişlərini cüt və tək olmaqla iki yerə ayıran ip.
Vərəngalan – ərişi daraqlayıb nizamlayan arğac üçün şərait yaradır.

Kirkid – arğacı ərişin arasına , ilmələrin üstünə oturdur.
Həvə – kirkidin gördüyü işi möhkəmlədir.
Əriş – hanada şaquli istiqamətdə olan iplər.
Arğac – ərişin arasına dolayı, üfiqi keçirilən ip. (İşlərim əriş, arğac olubdu, yəni işlərim bir birinə qarışıb).
İlmə – ərişlərə doladılıb düyün çalınan ip.
Yançı – əsas iş görənin köməkçisi.
İməci – bir günlüyə çağrılmış köməkçi.
Şülək – dəstələnmiş arğac.

## Xalq deyimlərində, sayaçı sözlərdə arxaik sözlərimizin əks olunması

**Kərəsini** qoyunun ,
**Kürəsini** qoyunun .
Ac olanda gəzərik,
Dövrəsini qoyunun.

Nənəm, a dəli qoyun
Dolanıb gəli qoyun.
Gəlinlər **güzəmindən,**
Toxuyar **xəli** qoyun.

**Əbrəş** sürünün gözü,
Dolandı dağı, düzü.
Bər-bəzkli **xurcunda**
Gəldi bir **əmlik** quzu.

Nənəm, qarala qoyun,
Bənzər marala qoyun.
Çoban yununu qırxıb.
Basar **xarala**, qoyun.

Qızlara **cehiz bağı**
Çobana **çarıq bağı.**
Qarılar tutar yağı,
Gəlinlər yeyər qaymağı.

## 3.Novruz bayramı ilə bağlı adətlərimiz və sözlərimiz

Yazın gəlişi havaların isinməsi, qarın əriməsi, çayların daşması, qarın altınan qarçiçəyinin (ağ rəngli olur) çıxması, danaqıranın, nğovruzgülü, inəklalası güllərinin bitməsi ilə özünü göstərirdi. Yazın gəlişi ilə bağlı adət-ənənəyə görə həyətlər təmizlənər, kirdar (toxunma məmulatları və yorğan-döşək) , ümumiyyətlə, ev əşyalarının hamısı gün qabağına tökülür və təmizlənərdi. Həyətlərdə nişan (puta) qoyulub güllə atılardı. Çərşənbələrdə tonqal qalanar və üstdən tullanardıq. Duzlu kömbə, əyirdək, aş, bişirilər, qovurqa qovrulardı. Qovurqa əl dəyirmanında (kirkirədə) üyüdülərdi. Üyüdülmüş qovurqa qovut adlanırdı. Qovudu südlə, balla, qarışdırıb yeyərdik. Buna qovut ovması deyərdilər. Gecələr şar atardıq. Uşaqlar dirədöymə, çilingağac, top-top, bənövşə-bənövşə və s. oyunları həvəslə, yorulmadan oynayardılar.

Novruz bayramı Azərbaycan xalqının ən qədim dövrlərlə səsləşən milli bayramıdır. Yaz fəslinin leksik anlamı, yəni adının mənası torpaqda yazı yazmaq kimi başa düşülməlidir. Sual oluna bilər ki, “Yaz” ismi öncə formalaşmış yoxsa, “yaz” feli?! Məncə, yazmaq feli Yaz ismindən öncə formalaşmışdır. Yaz fəslində torpaq üzərində görülən hər bir iş sanki torpağa naxış vurur, can verir, qan verir, torpağı dirildir, torpaq üzərində iz qoyur, yazı yazır. Toxa, xış, cüt və dəmir kotan torpağın qələmi, torpaqda naxış açan, yazı yazan alətlərdir. Bu alətlərin istifadə olunduğu fəsil “Yaz” fəsli adlanır. Yəni insan oğlu, şum əri bu alətlərlə torpağı yazır, torpaqda öz izini qoyur. Odur ki, belə bir deyim formalaşmışdır: “Torpaqda izi olmayanın, süfrədə üzü olmaz”. “İbtidai çağlara məxsus ilkin dünyaduyumu və arxaik mifoloji inanışlardan qaynaqlanan yazı — yeni günü qarşılama mərasimi yüzillikləri çevrələyən tarixi təkamül prosesi nəticəsində zəngin mədəni-mənəvi keyfiyyətlər qazanaraq geniş miqyasa malik xalq bayramına — Novruza çevrilmişdir...... . ” tarixin dərin

qatlarından yol alıb gələn Novruz bayramının tərkibi aşağıdakı iki əsas qatdan ibarətdir.

a) Təbiətin oyanmasını əks etdirən əski mifoloji qat;

b) Müxtəlif tarixi dönəmlərin ovqatını ifadə edən və inikas edən siyasi-ideoloji qat.

Birinci qat əsas və aparıcı axarı təşkil edir. Burada mövsüm mərasiminin genetik başlanğıcı, təkamül prosesi, tarixi-tipoloji mənzərəsi və humanist-bəşəri səciyyəsi öz əksini tapır. “İkinci qatda isə ayrı-ayrı epoxalara məxsus hakim sistemlərin mərasimdən məqsədli şəkildə faydalanmaq, onu öz ideolaji qəlibinə salmaq, siyasi mənafeyin icraçısına çevirmək niyyəti qərarlaşmışdır.” (səh. 5-7)

Üçü bizə yağıdır,
Üçü cənnət bağıdır.
Üçü yığıb gətirir,
Üçü vurub dağıdır.

Bu xalq hikmətində fəsillər — qış, yaz, yay və payız sıralanması ilə əks olunmuşdur. Bu sıralanmada hər fəslin özünəməxsusluğu da qeyd olunur. Qış fəslində yağan qar yazın 45-nə qədər dağlarda qalırdı və hətta tar uçqunlarına səbəb olurdu. Bunu yazmaqda məqsədim odur ki, həqiqətən, qış fəslində dağlarda həyat iflic vəziyyətində olur, qış fəsli sanki insanlara yağı kəsilir. Insanlar yığdıqları azuqəni (qış ehtiyyatını) qənaətlə yeyib –içib yazın gəlməsini gözləyirlər. Yazın gəlişini o qədər həsrətlə gözləyirlər ki, hətta qış yarı olanda “Xıdır Nəbi” deyilən oyun da keçirilirdi. Hər mövsümün öz adı, öz yeri olduğu kimi, hər oyunun və yaxud adətin də mövsümlər üzrə müəyyən vaxtda icra olunma anı vardır. Yazın gəlişi ilə bağlı adət və ənənələrin, oyun və inancların da öz düzümü , sanki süjet xətti vardır. Belə ki, qış yarı olanda “Xıdır Nəbi”, axırıncı çərşənbədə isə “kosa-kosa” oyunu, Novruz bayramında bayram şənliyi bu düzümü şərtləndirən anlam və icra olunan ənənələrdir. Bu ənənələr sırasında böyük çilə qırx günlük ömrünü başa vurur, kiçik çilədən beş gün keçdikdə fevral ayının beşi və yaxud altısında “Xıdır

Nəbi" ayini, oyunu icra olunurdu. Kəndimizin uşaqları bir yerə toplaşar (20-25 nəfər), uşaqlardan birini öz razılığı ilə üz-gözünü kömürlə qaralayıb, başına iki buynuz taxıb simvolik təkə düzəldərdik. Təkəni qapı-qapı gəzdirib, oynadıb pay dilərdik. Hər qapıdan (bir qab un, bir stəkan düyü, qənd, şəkər tozu, yağ, pendir, şor, ümumiyyətlə, kimin gücü nəyə çatırsa) pay verərdilər. Elə olurdu ki, iki kisə un, 20 kq yağ, 20 kq pendir, kisələrlə qənd, düyü, şəkər tozu toplanardı.

Təkəni oynada-oynada şapan vurub xor şəklində aşağıdakı sözləri xüsusi ritmlə söyləyərdik:

Təkəm bir oyun oynar,
Qurdunan qoyun oynar.
Yığar Şirvan düyüsün,
Çəpişin toyun oynar.

Xanım ayağa dursana,
Yük dibinə varsana.
Boşqabı doldursana,
Xıdırı yola salsana.

Bal gətirin, ballıyaq,
Yağ gətirin, yağlıyaq.
Verənin oğlu olsun,
Verməyənin də qızı.

Təkəm gəlir havadan,
Bir donu var yavadan,
Təkəmə arxalıq ver,
Xanım evin abadan.

Çatma, çatma, çatmaya
Çatma yerə çatmaya,
Xıdır payın kəsənin,
Ayağı yerə çatmaya.

Təkəmi yaradan, Allah!
Tükünü daradan, Allah!

Kim təkəmə pay versə,
Saxla bəladan, Allah!

Bu təkəmin qəndi var
Çox kəsəkli kəndi var.
Hər qapıda oynasa,
Bir nəlbəki qəndi var.

Təkəm getdi xanlığa,
Baş qoydu sultanlığa.
Təkəni öldürdülər,
Basdılar samanlığa.

Oyna şumalım, oyna,
Gözəl şumalım, oyna
Nə qov yeyər, nə qarpız
Yaxşı oynar bu tammuz.

Təkəni oynada-oynada bütün kəndi dolaşar və axırda yığdığımız kisələrlə unu, qəndi, düyünü, şəkər tozunu, yağı, pendiri, şoru və s. azuqəni kəndin ən kasıb ailəsinin evinə aparardıq. Həmin axşam o evdə xəşil (xaşıl) bişirilərdi. Yeyib-içib şənlənərdik. Qalan azuqəni isə həmin ailəyə verib evlərimizə gedərdik.

Bu mərasimin məqsədi yaza çıxmaqda çətinlik çəkən, azuqəsi tükənən ailəyə kömək, dayaq durmaqdan ibarətdir. İnanca əsasən dar məqamda köməyə çatan, əldən tutan Xızır peyğəmbər olduğu üçün bu mərasimin də adını onunla bağlı “Xıdır Nəbi” qoymuşlar. Çünki bəzən Xızır peyğəmərə Xızır İlyas, Xıdır Nəbi də deyirlər.

Xalq arasında kim işi dolaşdırıb xaotik vəziyyət yaradırsa, belə deyirlər ki, filankəs bu işi Xıdır Nəbi xaşılına döndərib və yaxud hər işə qarışan adama Xıdır Nəbi təkəsi kimi ortalıqda oynama — deyirlər.

"Təkə oyunu"nun simvolik mənası (keçi – mifologiyamızda xeyir gətirən, ruzi verən varlıq kimi səciyyələnir.), yəni qismən də olsa, kimsəsiz və kasıblara əlac olmaq məqsədi güdüldüyü kimi, həmin axşam məhz xaşıl bişirilməsi də rəmzi məna daşıyır. Belə ki, qış fəslinin insan həyatında çətinlik yaratması bir yandan soyuq, sazaq, qar, boran, çovğun, tufan, və s., o biri yandan azuqənin tükənməsi, ümumiyyətlə, bütün işlərin biri-birinə qarışması xəşilə (xaşıla) bənzəyir. Ona görə də xalq arasında — işlər Xıdır Nəbi xaşılına dönüb — deyirlər.

Deməli, "Xıdır Nəbi"də "Təkə oyunu", xaşılbişirilməsi, çərşənbələrdə tonqal qalanması, tonqal ətrafında oyunlar, "Kosa-kosa"oyunu, falabaxma, qapı pusmaq, niyət edib müxtəlif oyunlar oynamaq, həmin axşam duzlu kömbə yeyib su içməmək, süfrəyə 7 təam düzmək, su üstdən tullanmaq, yumurta boyamaq, yumurta döyüşmək, nişan qoyub güllə atmaq və s. və i.a. bütün bunlar uzun əsrlərdən bəri xalqımızın dünyagörüş xəzinəsi, milli-mənəvi dəyərləri və həyatabaxış fəlsəfəsidir. Onu da qeyd edək ki, xalq qış fəsli yarı olanda "Xıdır Nəbi" adı ilə qışın yarı olduğunu bayram edirlər. Yaz fəslinin yarı olmasına "Yazın qırx beşi", yay fəslinin yarı olmasına "quyruq doğdu" və yaxud "quyruq dondu" deyirlər. Payız fəslinin yarı olması haqqında heç nə eşitməmişəm.

Beş fevralda "Xıdır Nəbi" gecəsi it yox olardı. Dünyagörmüş baba və nənələrimiz söyləyərdilər ki, hər il bu gecə, "Xıdır Nəbi" olanda qurd (canavar) kütə (kürsəyə) gəlir. Kürsək qurd qancığı kəndə girər, köpək itləri arxasına salıb meşəyə aparardı. Aldadılaraq canavar sürüsünün içərisinə düşən köpəyi canavarlar parçalayıb yeyərmişlər. Ona görə də "Xıdır Nəbi" mərasimində söylənilən deyim maraq doğurur:

Təkəm bir oyun oynar,
***Qurdunan qoyun oynar.***

Qurdun (canavarın) motiv və ideyaları ilə səsləşən, bu gün də xalq arasında dolaşan əfsanələr, inam və etiqadlar, ovsun, alqış və qarğışlar, atalar sözü və məsəllər zəmin yaradır deyək ki, qurd xalqımızın qədim rəmzi daşıyıcısı, inam yeri olmuşdur. Boz qurda

köləlik yad olan xüsusiyyətdir. Ovçunun qurduğu tələyə qurd düşdükdə (qurd tələyə biləyindən düşər) biləyini çeynəyib üzər və tələdən qurtular. Ona görə də xalq arasında qorxubilməz cəsur igidə "qurd ürəyi yeyibdi" — deyirlər. Deyirlər ki, qurdun ağzı quran ayəsidir. Kim qurdun ağzına söyərsə, qurd həmin adama ziyanlıq yetirər. Xalq arasında igid, qoçaq adama "qurd qarnında pay qoymaz" adam — deyirlər.

Boz qurd özünəməxsus təlim quruluşuna, üsuluna malikdir. Belə ki, balalarını lap körpə vaxtı dəlməkdə (qurdun yuvası) qanıxlaşdırır. Belə bir təlim üsuluna uyğun ulularımız müdrik kəlam yaratmışlar: "Gəlini gərdəkdə, uşağı bələkdə, qurdu dəlməkdə tərbiyə edərlər."

Aşağıdakı ifadə və atalar sözləri də ulularımızın deyimi, duyumu və yozumu ilə bağlıdır:

"Qurd ağızlı, canavar dişli", "Qurd qoyun dərisinə bürünsə də, qurddur", "Qurddan törəyən qurd olar", və s.

Müasir dövrümüzdə elələri də vardır ki, şair demişkən:

Qurdla quzunu yeyir,
Qoyunla şaxsey deyir.

Belə bir cəsur heyvanı türklər ərvah kimi qəbul edirlər və inanırlar ki, onlar qurd qancığından doğulmuşlar. Qıpçaqlar isə belə hesab edirlər ki, atalrı qurddur.

Başqurd etnoniminin leksik anlamından da şərhsiz göründüyü kimi qurd başına tapınma ilə bağlıdır.

Canavarın bir çox növləri vardır. Boz qurd, qara qurd, yalquzax, qızıl qurd, əzvay qurd əniyi, börü və s.

Türklərin igidlik və cəsurluq simvolu boz qurd hesab olunur. Qurd öz örüşündə , balaladığı ərazidə ziyanlıq etmədiyinə görə heç kəs onun balalarına dəyib, toxunmaz. Canavarın iki-üç və yaxud dörd balası olur.

## Toy mərasimi ilə əlaqədar adətlərimiz və deyimlərimiz

Toy mərasimi də xalqımızın ən qədim adətlərindən biridir. Toy mərasimi mövsüm mərasimi olan Novruz bayramı ilə sıx bağlı olmuşdur. "Kitabi-Dədə Qorqud"da belə bir bilgi var: "Bayındır xanın bir buğası vardı, bir dəxi buğrası vardı. Ol buğa qatı daşa buynuz ursa un kimi üyüdərdi. Bir yazın, bir küzin buğayla buğrayı savaşdırarlardı. Bayındır xan qalın Oğuz bəyləri ilə tamaşaya baxardı, təvərrüc edərdi.

Məgər, sultanım yenə yazın buğayı saraydan çıxardılar. Üç kişi sağ yanında , üç kişi sol yanında dəmir zəncir ilə buğayı tutmuşlardı. Gəlib,  meydan ortasında qoyu verdilər. Məgər, sultanım Dirsə xanın oğlancığı, üç dəxi ordu uşağı (meydanda) aşıq oynarlardı. Buğayı qoy verdilər, oğlancıqlara "qaç" dedilər. Ol üç oğlan qaçdı. Dirsə xanın oğlancığı qaçmadı. Ağ meydanın ortasında baxdı durdu." (26,19)

Bu sitatdan göründüyü kimi Ağ meydana camaat bir yazda, bir də payızda toplaşarmışlar. Ağ meydan dedikdə arzuların reallaşdığı, həqiqətə çevrildiyi məkan nzərdə tutulur. Hər hansı bir iş ciddiləçib reallığa çevrilərkən — sən bu işi, məsələni, ağ etmisən — deyrlər, yəni reallığa çevirmisən. Bir daha aydın olur ki, Ağ meydan küsülülərin barışdığı, sevgilərin reallaşıb bir-birinə qovuşduğu gündür. Bu gün toy-düyün günü, yeni həyatın başlanğıc günü olduğu üçün yeni günə — Novruz bayramına təsadüf olunur. Xan tamaşalara baxıb fərəhlənir, uşaqlar aşıq-aşıq oynayır, kəbin kəsilir toy edirlər.

Novruz bayramında qırmızı boyamaq, qırmızı asmaq toy mərasiminin rəmzidir.hətta xalq arasında eşqə düşən, sevən adama — "bunun dərdi Novruz dərdi" dir — deyirlər.

Toy mərasiminin mərhələləri də xalqımızın tarixi mənəviyyat muzeyi sayılan "Kitabi-Dədə Qorqud" dastanında öz əksini tapmışdır. Beşik kərtmə, elçilik, toy üçün kəsmət, yəni

kəsmət kəsilib, istənilən əşyalar və toy etmək, gəlin gətirmək dastanda ardıcıllıqla verilmişdir:

“Baybecan bəy aydır:

— Bəylər, Allah taala mana bir qız verəcək olursa, siz tanıq olun, mənim qızım Baybura bəyin oğluna beşik kərtmə yavuqlu olsun — dedi.” (26,43)

Nəhayət, Bayburanın oğlu Beyrək üçün Baybecanın qızı Banıçiçəyə Dədə Qorqud elçi gedir. Elçiliyi Banıçiçəyin qardaşı Dəli Qarcardan diləyir:

“Qarşı yatan qara dağını aşmağa gəlmişəm,
Axıntılı, görklü suyunu keçməyə gəlmişəm,
Tanrının buyruğu ilə, peyğəmbərin qövlilə,
Aydan arı, gündən görklu qız qardaşın Banıçiçəyi,
Bamsı Beyrəyə diləməyə gəlmişəm — dedi” (26,49)

Razılıq olduqda Dədə Qorqud deyir ki, söylə görüm nə istərsən.

“Dəli Qarcar aydır:

— Min buğra (nər) gətirin kim maya (üzün) görməmiş ola. Min dəxi ayğır gətiin kim, heç qısrağa açmamış ola. Min dəxi qoyun görməmiş qoç gətirin! Min də quyruqsuz, qulaqsız köpək gətirin. Min dəxi (iri) birə gətirin mana, dedi. Əgər bu dediyim nəsnələri gətirərsiniz, xoş verdim.” (26,60) Daha sonra toy adəti icra olunur.

Müasir dövrümüzdə də toy mərasiminin özünəməxsus mərhələləri vardır. (Elçilik, nişan və toy) Hər bir mərhələnin özünəməxsus qayda-qanunu və deyimləri vardır. Həmin mərhələlərlə bağlı gəlinin, qaynananın, bəyin, qaynatanın dili ilə çoxlu mahnılar söylənilir. Bu baxımdan xalqımızın adət-ənənəsini, mənəvi aləmini, həyat tərzini öyrənmək üçün toy mərasimi böyük əhəmiyyət kəsb edir. Bu gün ata-ananın xeyir duası və gənclərimizin özlərinin seçimi ilə oğlan evindən qız evinə elçi göndərilir. Elçiliyə seçilib-sayılan, dilli-dilavər ağsaqqallar göndərilir. Ağsaqqallar “hə” cavabı almayınca qız evində çay içməyiirlər. Şifahi xalq ədəbiyyatının öyrədilməsi və mərasimlər üçün hazırlıq mərhələsi insan övladının bələk anından

başlanır. Aşağıdakı laylalardan aydın olur ki, qız anası elçi arzusunda, oğlan evi isə "hə" cavabı istəyir;

Qız anası;

Badam badamı,
Oğlan adamı,
Qoy elçi gəlsin,
Alsın qadamı.

Oğlan anası;

Ay qız adamı,
Sındır badamı,
Elçiyə çay ver,
Alım qadanı.

Göründüyü kimi elçiyə çay verilməsi və elçilərin çay içməsi "hə" cavabı deməkdir.Odur ki, elçilik zamanı belə bir poetik ifadə formalaşmışdır:

Mən Aşiq o çaydan
O çaynikdi, o çaydan.
Bir "hə" sözün deməsən,
Vallah içməm, o çaydan.

Naçar qalmış qız atası deyir:

Mən Aşiqəm o çaydan,
O çaynikdi, o çaydan.
Çayı gəlinin süzüb,
Doyunca iç o çaydan.

Bu cavabdan sonra xeyir-dua verilir çay içib, çörək yeyib şadlıqla evlərinə qayıdırlar. Sonra adxlanma, nişan mərhələsi olur:

Al almağa gəlmişəm,
Şal almağa gəlmişəm.
Oğlanın bacısıyam,
Adaxlamağa gəlmişəm.

Bu deyimdə bir adət özünü qoruyub saxlamaqdadır. Belə ki, Novruz bayramında bacadan şal sallayarmışlar. Şal sallayanın kim olduğunu bildikdə qızlar cavab məqsədi ilə şala müxtəlif əşyalar bağlayırmışlar. Qız tam əmin olduğunu və toy olmasını istədikdə şalı ipdən açıb, oğlanın elçi göndərməsini istəyirmiş. Odur ki, elçi gəlib atanın "hə" cavabını alıb və sonra adaxlamağa gələn oğlanın bacısının mahnısında "şal almağa" gəlmişik ifadəsi də işlənir. Nəhayət, uzun get-gəldən sonra gəlini aparmağa gələndə söyləyirlər:

Al almağa gəlmişik,
Şal almağa gəlmişik.
Oğlanın adamıyıq,
Aparmağa gəlmişik.

Gəlini götürüb evdən çıxarkən oğlan evi söyləyir:

Verdik bir dana
Aldıq bir sona.
Ay qız anası,
Qal yana-yana.

Qız anası da sözsüz qalmır, söyləyir:

Yük üstündə kücü var,
Kücünün qırx ucu var
Al edib, qız aldınız
Sizdə bəylik gücü var.

Gəlin oğlan evinə gətirilərkən el arasında geniş yayılmış mahnı ifa olunur:

Anam-bacım qız gəlin,
Əl-ayağı düz, gəlin.
Yeddi oğul istərəm,
Bircə dənə qız, gəlin!

Gəlin qaynana problemi tarixən olmuş, olur və olacaqdır. Onların çəkişmələri gəlin gəldiyi gündən başlayır. Qaynananın deyimləri:

Gəlin gəlir xan gəlir,
Evləri yıxan gəlir.
Əlində ülgüc, dəhrə
Başları qırxan gəlir.

Evimə ozan gəlibdi,
Pərgarı pozan gəlibdi.
Gündüz olan işləri,
Gecələr yozan gəlibdi.

Gəlinə bax gəlinə,
Əlin qoyub belinə.
Gəlinə söz deməzlər,
Gedib deyər ərinə.

Qaynana hətta sevimli nəvəsini oxşadıqda belə gəlini sancmağı unutmur:

Sarımsağım, soğanım,
Yad qızından doğanım.
Yarısı ilan balası,
Yarısı canım parası.

Qaynananın arzu fantaziyaları: “Gəlinim paltar yuyanda oğlum gəlsin, qızım çörək bişirəndə yeznəm gəlsin.”

Əri ölmüş qızına anası təskinlik verir: “Dərd eləmə, yad oğlu ərim olsun gündə biri ölsün.” Inşallah, bütün ailələrə toy qismət olsun.

## Ərikli kəndində işlənən bəzi şivə sözləri və onların izahı

Laçın rayonunun Ərikli kənd sakinlərinin şivə leksikası Qasım uşağı adlanan tayfanın məskunlaşdığı Ələkçi, Narzan, Şamkənd, Bozdağan, Yuxarı Çorman, Qurdqajı və Ərikli kəndlərini əhatə edir. Bu kəndlərin sakinlərinin şivə leksikası türk leksikasının qədim qatını mühafizə edib saxlamaqdadır. Ona görə də bəzi sözlərin unudulub, itib-batmaması üçün bu qeydiyyatın aparılmasını önəmli saydım. Həmçinin belə sözlər müasir Azərbaycan dilinin lüğət tərkibi üçün arxaik və keçid mərhələsində olan sözlərdir. Odur ki, gənc nəslin belə sözləri öyrənməsi üçün yaddaş süzgəcimdə olanları qələmə aldım:

Ağnağaz – növbədənkənar görülən hər bir iş. Əsasən dəyirmanda növbədən kənar üyüdülən una deyilir.

Ağuz – doğan heyvanın ilk südü.

Alaf – ot.

Arxac – qoyun, quzu üçün ayrılmış yer.

Arxana (arıxana) – arı pətəkləri olan yer.

Arğac – (əriş-arğac) – hanada şaquli iplərə əriş, erişin içərisinə salınan dolayı ipə isə arğac deyilir.

Atalıq – ögey ata.

Analıq – ögey ana.

Atıcı – keçəçi, keçə hazırlayan adam.

Av (ov) – çöl heyvanlarına ov deyilir.

Bad – buxarının, kürənin, təndirin, divarı, divar daşı, çörək yapılan daş.

Buxarı – divarda hörülmüş ocaq yeri.

Buxarı qurum saxlar,
Od yanar, qurumsu ağlar.
Aşıq der: ər libasın
Geyməsin qurumsaqlar.

Bafa – biçinçinin bir əlin içi tutuncuya qədər biçdiyi taxıl.

Balax – təzə doğulmuş camış balası.

Batman – on dörd girvənkə.

Başəyax – biçin zamanı yerə tökülən sünbülün yığılması, buna başaq da deyilir.

Beddam – biabır olmaq, rüsvay olmaq.

Bərəmum – arı mum, araları, bərələri bağlamaq üçün arının etdiyi mum.

Bicənək – ot biçmək üçün qorunan biçin sahəsi.

Boyundurux – ağacdan hazırlanır, iki öküzün boynuna taxılıb iş görülür. Bu öküzlərə bir boyun öküz deyilir.

Bulama – təzə doğan inəyin südündən hazırlanır. Bişənə qədər bulamasan çürüyər. Oxlayı və yaxud çömçə ilə bulayırlar.

Bulamac – bişməmiş un horrası.

Bülöv – şumal daş, cilalı daş.

Bacılıq – ögey bacı.

Boynaq – işə yaramayan, yaltaq, xəbərçi, aravuran, yaramaz adamlara boynaq deyilir. M.Kaşğarı yazır ki, türklər ilana ağı verən heyvana boynaq deyirlər.

Cad – çovdar , darı, qarğıdalı unundan bişirilmiş çörək.

Mən aşiq bağçada gül
Bağda gül, bağçada gül.
Aşiqə gülən Yaxşı,
Əlində bax cada gül.

Cacıq – bitki növü.

Cam – mis kasa.

Cejim – palazın bir növü.

Cələ – at quyruğundan hazırlanmış tələ.

Cəvərən – səbət.

Ceviz – qoz.

Cılfır – balaca, cılız.

Cılxa – xalis.

Cılxı – tüklü üzü çöldə olan dəri.

Cıvırıx – çılpaq, lüt.

Cüt – xış, yer əkmək üçün ağac kotan.

Çatma – nehrə çalxamaq üçün üç haça ağacın baş-başa qoyulması.

Çatal – qoşa, birləşmiş, qovuşmuş əşya, iki qola ayrılmış sahələrin birləşdiyi yer.

Çağala – yetişməmiş meyvə.

Çatı – gödək ip.

Çaşır – bitki növü.

Çeyil – bataqlıq olan yer.

Çoqqal – tilişkə.

Çanax – ağacdan düzəldilmiş qab (16 kq taxıl tutur) həmçinin balaca çanaxlar da olur ki, onun içində qənd qırırlar və 2.3 kq qənd tutur.

Çoçun –alban dilində adam yerinə qoyulmayan kimsəyə çoçun adam deyilirmiş. Biz isə mənə çoçun gəlir və yaxud çoçunuma gəlir deyirik. Yersiz, ayıb, yad, mənə yaraşmayan anlamında işlənir. Yəni mənim ayıbıma gəlir mənasını verir.

Çəhlim – şehli sahədə düşən iz.

Çərək – 25 sm taxta.

Çətən – alaçığın yanlarını örtmək üçün qarğıdan toxunmuş həsir.

Çimir – bir anlıq mürgüləmək.

Çiş – balı süzülmüş şan.

Çiskin – sərin-sərin yağan yağış.

Çiv – paz, çüy də deyilir.

Demi – qəlyan.

Dizlik – kişinin alt paltarı.

Dınqılı – balaca, xırda, cıqqılı.

Duvax – gəlinin fatası, qapaq – ağacdan hazırlanır.

Duzdax – heyvanlara duz verilən yer.

Pilək – düymə.

Əlçim – daranmış əl boyda un.

Ərəmik – doğmayan (heç vaxt doğmayan mal)

Əriş – hananın şaquli ipləri.

Ətənə – doğuşdan sonra düşən ət parçası.

Farmaş – ipdən toxunmuş yorğan – döşək qabı
Girvənkə – 400 qr .
Gəzyazma – birinci il buğaya gəlməyən düyə.
Giviş (Halış da deyirlər) – meyvə ağacı.
Girəvə – fürsət.
Güzəm – payızda qırxılan yun.
Hazarpeşə- stəkan, nəlbəki yığmaq üçün çamadan.
Heşan – taxıl səpilən yer.
Həvə - toxuculuq aləti.
Hodax – boyunduruğa minib öküzləri idarə edən adam.
Həng etmək – yamsılamaq.
Hoqqa – bir kiloqram.
Hoqqa – qayda-qanun (özündən hoqqa çıxarma)
Höyürə gəlmək – buğaya gəlmək.

Həyyəananın duzdağı – təbii duzdax idi, təbii olduğuna görə Həvva ananın duzdağı kimi qeyd olunmuş, tələffüzdə isə Həyyəananın duzdağı kimi deyilmişdır.

Xərək - əkinin içində əkilməyən hissə.
Xıl – it sürüsü.

Xaxan—yaxın, dost, həmdəm. (O xaxan adamdı, yəni mənə münasib adamdır.)

Xorum – bükülüb qatlanmış bir qucaq ot.
İrəşmə – keçi tükündən toxunmuş ip.
Gav – qayalıqdan keçən yol.
Gərgi- qəlib (tülkü, canavar dəriləri üçün qəlib)
Kaha – zağa.
Kəfrəm – üzsüz yorğan-döşək.
Kərki – dəmir alət.
Kəndi- taxıl, un yığmaq üçün ağacdan hazırlanmış qurğu.

Kələmcoş – qurudu qurud çanağına töküb su ilə ovuşdurub, ayran şəklinə saldıqdan sonra yağ əlavə edib, içərisinə yuxa qırıqları qatıb yeyimişlər ki, buna da Kələmcoş deyirmişlər.

Kərt – qırış, qat, gəz.
Kiriş – qoyun-keçi bağırsağından hazırlanmış ip, bağ.

Kürmək etmək – ipin xüsusi bağlanma forması.
Kərənti (dəryaz) – ot biçmək üçün alət.
Kirkid – toxuculuq aləti.
Kirkirə – əl dəyirmanı.
Köşə – gönün qırağından çıxarılan sıyrım.
Külfə – pəyənin, təndirin, hava çəkən yolu.
Külfət – ailə üzvləri.
Kürnəş – qoyunun isti vaxtı bir yerə toplaşması.
Küz – payız yurdunda qazılmış quzu arxacı.
Qılloru yağır – kiçik dolu.
Qamqalaq – odundan qopan xırda parçalar qalığı.
Qaraqayış – üç boyun (cut) öküzün orta cütlüyünə deyilir.
Qardaşdıq – ögey qardaş, toy qardaşı, (sağ diş, sol diş)
Qatma – ip.
Qabqarmaq – qablaşdırmaq.
Qıpıx – gözünü ara vermədən qırpan.
Qızlıq - [qızdıx] – ögey qız.
Qırxlıq – qoyunu qırxmaq üçün alət.
Qırışmal – qırışıq adam, alçaq, dəyus adam.
Qıxmıx – balaca qırıqları qamqalağın xırdası boyda.
Qovurqa—qovrulmuş buğda.
Qovud—üyüdülmüş qovurqa.
Qolay – keyfiyyətsiz –

Çalmam dolayı düşdü,
Çaldım dolayı düşdü.
Qisməti payladılar
Mənə **qolayı** düşdü.

Qotaz – lazım olan yerdən asılan rəngli yumru ip.
Qulac – iki qolun uzunluğu (qol aç deməkdir)
Qulunc – kürək əzələsinin soyuqlaması.
Qursax – mədənin bir hissəsidir, kövşəyən heyvanların mədəciyidir.
Qurut – qurudulmuş şor.
Lül – tamamilə, xalis.

Lağar qoç – damazlığa yaramayan, döl verməyən qoç.
Lağım – yeraltı oyuq.
Löhmə - bataqlıq, palçıqlı yer.
Ləj düşmək – düşmən kəsilmək.
Ləvərə - yekəpər.
Lijim – görünüş, quruluş, forma.
Liləmar – ılıq.
Lırt – boş, tör-tökül.
Lomba – bütöv, koma.
Lopa- iri.
Maj – kotanın dəstəyi.
Majgal – maj tutan.
Marıq – pusqu.
Maya – 1) dırnağın altı, mayası.
2) xəmir mayası.
3) qatıq mayası.
4) pendir mayası.
5) dəvənin dişisi.
Mavrı – pişiyin balası.
Mafraq – zəif, tez qırılan.
Mərək – ot, saman yığılan yer.
Mərəkə – yığıncaq.
Mil – damın, evin üstünə qoyulan tir, ağac.
Meşok – kisə.
Mitil – yorğan-döşək, yatacaq.
Mırıx – dişsiz adam.
Mozalan – bərk sancan iri həşərat, milçək.
Məzməzək – qurd səpən milçək.
Muşqurmaq – atı muşqururlar, dodaqları birləşdirib sorurlar.
Ovxarlamaq – itiləmək.
Oğlu – nəsil mənasında işlənir (Əhməd oğlu, Albəy oğlu)
Öfgə – ağ ciyər.
Oğulluq – ögey oğul.

Örkən – 8-10 sm enində yer hanasında toxunur. Palanı bərkidmək üçün işlədilir, doğanaqla bərkidilir, doğanağa təng vurulur. "Örkən nə qədər uzun olsa da, gəlib doğanaqdan keçər" — deyirlər.

Örüş – otlaq yeri.

Örən yer –

Öyəc – üçdən artıq yaşı olan erkək qoyun cinsi.

Əyirdək – şirniyyat növü (südlə yoğrulur, yağda qızardılır)

Əvnə – vaxt, heyvana ot verilmə vaxtı.

Parç – misdən olan iki qulplu su qabı.

Pencə – iyirmi-otuz dərz taxıl.

Peşqurt – taxılın ilk nübarı.

Pəl vurmaq – işi pozmaq.

Pərdi – iri çərək.

Pərsəng – tərəzini tarazlayan əşya, daş.

Sacayağı – üçayaq qazanaltı.

Sağır – yetim, sahibsiz.

Sal daş – bütöv, yastı daş.

Salba – salmaq üçün atılan vasitə, ağac (qoz ağacına salba atmaq)

Samı – boyunduruğu öküzün boynuna bağlamaq üçün istifadə olunan ağac.

Samı bağı – samını öküzün boğazının altından bağlamaq üçün istifadə olunan ip.

Sapılca – qulplu tava.

Savlamaq – itiləmək.

Sayıl – dilənçi.

Sazax – quru soyuq külək.

Sədəf – 1.dırnaq, 2.düymə növü.

Sajeyin – üst-üstə çinlənmiş odun, çin-çin hörülən deməkdir.

Sərnic – iki qulplu mis qab.

Silə – dolu.

Sini – mis padnos.

Sirpiş – kotanın palçığını təmizləmək üçün istifadə olunan ağac.

Sertov – pencək.

Sütül etmək – başaqı (başayağı) yığıb, ütüb, ovub yemək.

Şadara – iri gözlü xəlbir.

Şapalax – sillə.

Şahad – dəyirman haqqı.

Şişək – iki yaşlı doğmamış qoyun.

Şitəngi – sırtıq, dəcəl, hər işə qarışan.

Şıntır – sallaq, tör-töküntü.

Şumal – hamar, cilalı.

Şivən – hay-haray, ağlaşma.

Tab – dözüm, taqət.

Tapqır – yəhəri atın belinə bərkitmək üçün istifadə olunan qayış.

Tar – toyuq tarı, qar uçqunu, qar yığını, çalınan tar.

Tavlamaq – ipi burmaq, fırlatmaq, ipi tavlamaq.

Tovlamaq – bir işə sövq etmək, aldatmaq.

Tolamazda – yıxmaq, məğlub etmək üçün atılan daş, ağac, söz (filankəs filankəsə tolamazda atdı, yəni söz atdı)

Taya- ot topası, yığını. Hündürlüyü 20-30 metr olur.

Ter – iri, dolu.

Teşi—ip tavlamaq üçün qədim alət.

Təhnə – çörək qabı, xəmir təhnəsi, un təhnəsi.

Təng etmək – ipin doğanağa bağlanma forması.

Tərrik – yəhər altlığı.

Tirə – nəsil mənasında işlənir. Səməddər tirəsi, Şirinlər tirəsi.

Tirə – qohum-əqrəba bölümü (Məşədi Şükürün tirəsi)

Tığ vurmaq – qalaqlamaq.

Tutya – az tapılan şeyə deyilir.

Urvat – hörmət, qiymət.

Urba – çörək yayılarkən onun üzərinə səpilən un. Dördayağın baş küncünə tökülür. Urbalıq un.

Uşağı – nəsil mənasında işlənir. Qasım uşağı, Bağır uşağı, Əhməd uşağı və s.

Üşənmək – qorxmaq.

Ürpənmək – qorxmaq.

Vəğağa – yuxu.

Vayıs – şər işin səbəbkarı.

Vər – sıra, cərgə.

Vərgal – gəzişmə.

Yabı – tənbəl, pis yerişli, ölgün erkək at.

Yağır – atın belində sürtünmə nəticəsində üstü açılmış yara.

Yapağı – yazda qırxılan yun.

Yavannıx – süd məhsullarına (yağ, pendir) deyilir.

Yük – 1.yığılmış yorğan-döşək, 2.şələ mənasında (çiynində yük daşıyıram.)

Zol – şırım, göndən uzununa kəsilmiş hissə.

Zoddu – güclü, özünü dartan.

Zırı – yekə, pəzəvəng, qanmaz.

Zır – qanmaz, kobud.

Zir – kotanla çəkilən cızıq.

Zəyərək – dənli bitki növü. (“Zərb zəyərəkdən yağ çıxarar” məsəldir.)

Zəqqum – tam acı, zəhər.

Zəllə – xəsis

Zağa – mağara, kaha.

Dirək – damın milinin altına dirənmiş dayanacaq.

Döyrə – dəmir boşqab.

## Mis qablar

Kasa, döyrə, sapılca, qazan, parç, tayqulp, abgərdən, sərnic, tas, aşsüzən, sini, cin qazan, it yatan qazan, badya, tuluq ağızlığı, teşt, səhəng, bardax.

—Mis qazanın **paxırı,**
Oğlan qaytar naxırı.
Sən mənimsən, mən sənin.
Budur sözün axırı.

## Kəndimizin bəzi adətləri

Adətlər-ənənələr milli-mənəvi dəyərlərimizin bir hissəsi olduğu üçün böyük önəm kəsb edir. Odur ki, Ərikli kəndinin də özünəməxsus adət və ənənələri özünəməxsusluğu ilə qonşu kəndlərdən fərqləndiyi üçün xüsusi olaraq qeyd etməyi önəmli sayıram. Odur ki, müdriklərimizin dediklərinə əməl etməyimiz adətə çevrilir;

— Şər vaxtı evi süpürmək bəla gətirər.
— At nalını zibilliyə atmazlar.
— Tərəzinin üstündən keçməzlər.
— Süfrə üstündən keçmək günahdır.
— Tüfəng üstdən keçmək qəti qadağandır.
— Hamilə qadın təzə bar verən bağa girməməlidir.
— Ulağın başın yuyanda, yağış yağar.
— Xoruz kimi banlayan toyuğu kəsərlər.
— Axşam çağı dırnaq tutmaq günahdır.
— Qaynar suyu birdən-birə yerə tökmək günah sayılır.
— Axşam çağı pay vermək qadağandır.
— Ac olanı doyurmaq savabdır.

## Novruz bayramı gəlişi zamanı adətlərimiz

Yazın gəlişi ilə əlaqədar elliklə hamı həyət-bacanı, evi-eşiyi təmizləməyə başlardı. Çərşənbələrdə tonqallar qalanardı, böyük-kiçik hamı tonqalın üstündən tullanaraq, mahnılar oxuyardı:

Ağırlığım-uğurluğum odda yansın deyilərdi. Sac asılar qovurqa qovrular, kirkirədə qovud çəkilərdi. Qovudu südlə balla ovub yeyərdik. Gizlənpaç, dirədöymə, çilikağac, bənövşə-bənövşə, qazlar-qazlar, arxaya dəsmal atıb aldatma və s.oyunların dadını çıxarardıq. Bir qrup adamlar (ovçular) nişan (puta) qoyub güllə atırdılar.

Birinci çərşənbəyə su çərşənbəsi deyərdilər. Söyləyərdilər ki, daha bu gündən sonra su donmaz: Çərşənbə suya düşür — deyirdilər.

İkinci çərşənbə od çərşənbəsi adlanır. Deyirdilər ki, bu gündəən etibarən ocaq qalamaq lazım gəlmir, ocaq adama yapışmır, yəni havalar artıq isinməkdə davam edir.

Üçüncü çərşənbəni torpaq çərşənbəsi adlandırırdılar. Deyirdilər ki, torpaq oyanır, yəni donu açılır. Torpağın qayğısına qalmaq — onu şumlamaq, becərmək lazımdır.

Dördüncü çərşənbə külək çərşənbəsi adlanırdı. Deyirdilər ki, bu dövrdə külək əsir təbiəti bütövlükdə qış yuxusundan oyadır. Ümumiyyətlə söyləyirdilər ki, abu, atəş, xaki, bad çərşənbələrin düzümüdür.

Dördüncü çərşənbədən sonra kortum kökünü çıxarıb, yuyub, qaşıyıb yeyərdik. Qoqqulik, Ağcabaş köklərinin ləzzəti, dadı hələ də damağımdan getməyib.

Mən bu bilgiləri yazdığım zaman kəsiyində, Laçınımın qayasını-daşını, dərəsini-təpəsini, dağını-düzünü, çəmənini-çiçəyini, meşəsini-talasını, güneyini-quzeyini qarış-qarış gəzməklə bərabər, zümrüd bulaqlarından su içib, billur kimi təmiz havasını ciyərlərimə çəkib, 24 (iyirmi dörd) il öncəyə laçınlı günlərimə qayıtdım. Özümü atalı, analı bəxtəvər sanıb, məcburi köçkün adından qurtuldum. Inşallah! Hələ də ümidlə, arzuyla, xəyalla yaşayıram. Bu hisslər məndə yoxsa, demək, mən yoxam, mən ölmüşəm.

Yumruq boyda ürəyimdə
Laçın boyda yaram vardır.
Sağım uçuq, solum uçuq,

Deyin mənim haram vardır.
İldırım Ərtəpə.

## Deyimlər və yozumlar

Əsil azmaz, coşar,
Yağ çürüməz, daşar,
Duz iylənməz, yaşar. (yəni nəmlənər)
Qoyma ağıldan ağıl olmaz,
Özgə oğlundan oğul olmaz,
Kobud qızdan gəlin olmaz,
Danalı inəkdən sağın olmaz.

Babalarımız qısa və yığcam sözlə həmişə dərin məna və fəlsəfi hikmət dolu söz hörgüsü nəqş etmişlər. Odur ki, hikmətli deyimlərə məntiqi prizmadan yanaşıb real anlam əldə etmək lazımdı. Bu baxımdan folklor dərin fəlsəfi duyuma və elmi məntiqə söykənir. Məsələn, “Düz düzdə qalar” deyirlər. Əslində bu deyim düzgün ifadə olunmur. Doğru deyim belədir: “Düz düz də qalar”. Yəni düzə zaval yoxdur, həmişə düz olaraq qalacaqdır.

Başqa bir deyim: “Yeməkdən sonra qırx tikə pendir yeyərlər” – deyiblər. Çünki pendir həzm prosesini nizamlayır. Amma elə bir adam tapmaq olmaz ki, yeməkdən sonra qırx tikə pendir yeyə bilsin, bu mümkün deyildir. Odur ki, doğru deyim belədir: “Yeməkdən sonra qırıx tikə pendir yeyərlər”.

Nümunələrdən də göründüyü kimi səhv deyim yalnış fikir formalaşdırır. Belə yalnışlıqlara elmi-bədii ədəbiyyatlarda da rast gəlirik:

Yük üstündə cücü var,
Cücünün qırx ucu var.
Al edib, qız aldınız,
Sizdə bəylik gücü var.

Əslində isə bu mərasim deyimini xalq belə formalaşdırmışdır:

Yük üstündə kücü var,
Kücünün qırx ucu var.
Al edib, qız aldınız,
Sizdə bəylik gücü var.

Bədii ədəbiyyatda belə bir bayatı vardır:

Mən Aşiq ləngəridi,
Gəmi də ləngəridi.
Çox bilib, az danışmaq
İgidin ləngəridi.

Amma bu bayatı rəvayətlə bağlı yaranmışdır. Kənddə kəndirbaz kəndirin üstündə ləngərsiz sinini ayaqları ilə sürüşdürə-sürüşdürə apardığına görə soruşurlar ki, kəndirbazın əlində ləngəri yoxdur, o ləngərsiz necə hərəkət edir?! Cavabında isə söylənilir ki, sini də ləngər rolunu oynayır. Bu tamaşanı seyr etmiş Sarı Aşiq bayatını belə söyləmişdir:

Mən Aşiq ləngəridi,
Sini də ləngəridi.
Çox bilib, az danışmaq
İgidin ləngəridi.

## Dünyanın ünvan dili,tarixi pasportu və etnik sikkəsi olan onamastik vahidlər

Meşə, güney və çöllərimizdə bitən aşağıda sadalanan bitki adları mənim üçün doğma və əzizdir. Həmçinin böyük önəm kəsb edir. Ona görə ki, sadalanan bu bilgilər bütövlükdə Laçın ərazisini əhatə etməklə Laçın rayonunun strateji mövqeyini şərtləndirir.

### Ağac, meyvə, gül-çiçək, bitki adları.

Həmərsin (itburnu), giviş (halış), yemişan, qaragilə, zirinc, tubulğa, dovşanalması, alma, armud, əzgil, palıd, ulas, qarağac, daş armudu, quş armudu, cökə, gəvriş, fındıq, qoz, tozağacı, ağcaqayın, zoğal, mırdarça, alça, gərməşov, danaqıran, novruzgülü, qarçiçəyi, inək lalası, qokqulik, ağcabaş, şoşan, cacıx, çaşır, yemlik suddüyan, əməköməji, əvəlik, qatırquyruğu, bat-bat, çətənə, zəncirotu (acıqabığı), bənövşə, nərgiz, peşəməngül, kəklikotu, qırxbüzük, gicirtkan, yarpız, çiriş, sarmaşıq, baldırğan, quzuqulağı, quzuqarnı, göbələk, qırxbuğum, qantəpər, gülxətmi, cincilim, ximi, dəli ximi, xıncılouz, xazaz, andız, dolmayarpağı, lilpar, bağayarpağı, məröycə, çobandarağı, gəndəlaş, ayıdöşəyi, çiyələk, meşə çiyələyi, kortum, çiriş.

### Bulaq adları

Qönçənin bulağı, Göy bulaq, Damcı bulaq, Albəyin bulağı, Alışanın novu, Daş bulaq, Qızıl bulaq, Sızqaların bulağı, Səməddərin bulağı, At bulağı, Ayğır bulağı, Səltənət qaçan bulaq, Kor bulaq, Şor bulaq, Paşa bəyin bulağı, Mürüdün bulağı, Quzey bulağı, Soyuq bulaq, Qotur bulaq, Həmzə bulağı, Pəri bulağı, Korca bulaq, Dağdağan bulağı, Yağlı bulaq, Qırmızı bulaq, Cırrannı bulağı.

## Meşə adları

Qədimin meşəsi, Hünüsün meşəsi, Muncuqlunun meşəsi, Qaranlığın meşəsi, Sallıkın meşəsi.

## Dağ adları

Qırxqız dağı, Dəli dağ, Ming dağı, Sağsağan dağı, Soltanheydər dağı, Üryandağ, Çarçenbent dağı, Çalbayır dağı, Çaqmaqçay dağı, Çilgəz dağı, Qarğış dağı, Əmrəpirgic, Cidalar, Keş dağı, Dəmirçi dağı, Şiney dağı, Ağoğlan dağı, Ağyar dağı, Alagöllər dağı, Alçalı dağ, Alxaslı dağı, Barmaqlar dağı, Qızılboğaz dağı, İşıqlı dağı, Kirs dağı, Bük dağı, Qaradag, Dadməlik dağı, Dördqardaş dağı, Yəhərtəpə dağı, Lülpər dağı.

## Yaylaq və yurd adları

Əhmədbəyli yaylağı, Məşədi Şükürün yurdu, Şəmirin yurdu, Aralıq yurdu, Yaranalın yurdu.

## Dərə adları

Həşimin dərəsi, Zoğallı dərə, Şamkənd dərəsi, Şəlvə dərəsi, Şanazəryüyürənin dərəsi, Şirin suyun dərəsi, Kirri suyun dərəsi, Qozun dərəsi, Kar daşın dərəsi, Abadxeyir dərəsi, Ağsuçay dərəsi, Almalı dərə, Alpout dərəsi, Anavad dərəsi, Bayqara dərəsi, Bük dərəsi, Qanlı dərə, Qaranlıq dərə, Quzğunlu dərə, Qurd dərəsi, Qutan dərəsi, Dibəkli dərə, Eşmə dərə, Çaxmaqlı dərə, Çalağan dərəsi.

## Daş və Qaya adları

Kar daş, Dəlik daş, Haça daş, Pələng qayası, Böyük qaya, Qara qaya, Qızıl qaya, Sarı daş, İlan qayası, Kotan qaya, Ala qaya, Ağ qaya, Alaşar qaya, Ballıqaya, Qazanqaya, Qaranlıq qaya, Quzğun qayası, Qurduçan qaya, Dərviş qayası, Hoçaz qayası, Çal qaya, Çirişli qaya, Uluqaya, Umay daşı, Umay qayası.

## Arxac adları

Daş arxac, Arxac çalası, Ağdərə ağılı.

## Yal adları

Oyuğun yalı, Tazının yalı, Navrızölənin yalı, Çınqılın yalı, Qəbirlinin yalı, Uzun yal, Göyçiçəklinin yalı, Çaşurrunın yalı, Qoyurtqıranın yalı (Yəni qoyunu qurd qıranın yalı), Hünüsün yalı, Həmərsünnünün yalı, Zambalannının yalı, Şorun yalı, Buxarının yalı, Ağyal, Bəzirgan yalı, Qız qəbiri yalı, Ağalının yalı, Xarratın yalı.

## Göl adları

Dəyirman gölü, Çobanboğulan, Balıqçıxmaz, Qoyun gölü, Qara göl, Quru göl.

## Körpü adları

Zabığın körpüsü, Çiçəyin körpüsü, Pircan körpüsü, Sınıq körpü.

## Qəbiristanlıq adları

Araflı qəbristanlığı, Qəbirri, Balonun qəbri, Tək qəbir, Sümüklü qəbristanlığı.

## Güney və quzey adları

Niftalının güneyi, Qoruq güney, Sərf güney (sərt), Daşdı güney, Qırmızı güney, Bala quzey, Böyük quzey, Qaraquzey, Qaragüney, Sallıkin güneyi, Çalbayır quzeyi.

## Düz adları

Araxışın düzü, Ağabəyli düzü, Ala ağacın düzü, Ağbeyin düzü, Ağcayazı düzü, Böyük düz, Qarasu düzü, Bazar düzü, Əjdaha düzü, Ərəb düzü, Gəncəhan düzü, Səlcuq düzü, Şirəkarın düzü.

**Kaha, zağa adları**

Bəylərin zağası, Alyar kahası, Balax zağası, Dəvə kahası, Əjdaha kahası, Öküz kahası.

**Təpə adları**

Qabaq təpə, Top təpə, Göytəpə, Ağcayazı təpəsi, Ağsu təpəsi, Ağtəpə, Baldırğanlı təpə, Bük təpəsi, Qazantəpə, Dərviş təpəsi, Diktəpə, Kəkilli təpə, Kültəpə, Çarçanbent təpəsi, Ərtəpə təpəsi, Farmaş təpəsi.

**Gədik adları**

Cinni gədik, Qurd gəzi, Yelli gədik, Arpa gədiyi, Qanlı gədik, Kanqlı gədik.

**Kövşən adları.**

Köşənnər, Araxışın düzü, Böyük düz, Daşın başı, Aralıq yurdu, Göl yeri, Arpa gədiyi, Darı yeri.

**Çay adları**

Həkəri, Muncuqlu çayı, Qozdu çayı, Qarasaqqal çayı, Namlı şayı, Şəlvə çayı, Şamkənd çayı, Ağoğlan çayı, Ağsu çayı, Bayandur çayı, Bəzirgan çayı, Qaranlıq çayı, Alpan çayı, Ağ çay, Hoçaz çayı, Alpout çayı, Pircan çayı, Piçənis çayı.

Qeyd; Bu çaylar Həkəri çayına tökülür, Həkəri çayı isə Araz çayına qovuşur.

**Tayfa adları**

Qasım uşağı, Əhməd oğlu, Bağır oğlu, Alıbəy uşağı, İbrahim oğlu, Səlcuqlar.

## Qarışıq adlar silsiləsi

Darı yeri, Göl yeri, Bəylərin alması, Həyəananın duzdağı, Qaranlıq meşə, Sirəfilvurulan, Şırranın başı, Qayanın başı, Bayramın yerinin başı, Şirəkarın yeri, Taxta başı, Araxışın düzü, Böyük düz, Bazar düzü, Ağcayazı çölü, Ağdərə ağzı, Eşmə dərə ağzı, Ağyoxuş, Palantökən yoxuş, Sarı yoxuş, Alçalı çuxur, Almalı çuxur, Qarağaclı çuxur, Kamallı şuxuru, Altuntaxta aşırımı, Kömür aşırımı, Arxac çalası, Pəri çınqılı, Sarı gav, Buxarının yolu, Firəng yolu, Şavazın bağı, Avazın çardağı, Alıbəndənin talası, Qədimin talası, Fındıqlı tala, Sərt tala, Niftalının dəyirmanı, Səməndin dəyirmanı, Rustamın dəyirmanı, Araxış kilsəsi, Qarasaqqal kilsəsi, Kiş vəngi, Xaç daşı, Xaçınyalı, Xaçın bulağı, Ağbulaq qışlağı, Ayrım qışlağı, Ulu qışlağı, şirin su, Kirri su, Qoturru su, Goy burun, Marallı burun, Məmişin biçənəyi, Alıbəyin biçənəyi, Atçapılanın yalı, Şəmirin binəsi, Vəlinin binəsi, Vəzzoxlar, Şirəkarın talası.

## Söz və məntiqi düşüncə

Hər bir şəxsin dünyagörüşünün inkişafı, düşüncə tərzinin dərinliyi, intellekt səviyyəsinin yüksəkliyi onun leksikonunun zənginliyindən bilavasitə asılıdır. Odur ki, təhsilin qarşısında duran əsas amillərdən biri də gənc nəslin söz ehtiyyatının zəngin olması üçün bir sıra üsullardan istifadə etmək, müasir tələblər səviyyəsində onların bilik və bacarıqlarını inkişaf etdirməkdən ibarətdir. Bu sahədə şücaət göstərən, fədakarlıqla dözüm nümayiş etdirən, əmək sərf edən hər bir müəllimin dəyəri ölçüyəgəlməz dərəcədə qiymətlidir.

Dünyanın əşrəfi olan insanın sözə, dilə malik olması onun düşüncəsinin inkişafı, intellekt səviyyəsinin artması və ayrı-ayrı elmlərə yiyələnməsi deməkdir. Lal və kar olan adamın düşüncə tərzi az, fiziki inkişafı çox olur. K.D. Uşinski yazmışdır: “Ana dili hər cür əqli inkişafın əsası və bütün biliklərin xəzinəsidir. Uşaq ana dilini öyrənərkən yalnız şərti səsləri öyrənmir, o eyni

zamanda ana dilinin doğma döşündən mənəvi həyat və qüvvət içir. Ana dili təbiəti ona heç bir təbiətçinin izah edə bilmədiyi bir şəkildə izah edir: o, uşağı onu əhatə edən adamların xarakteri ilə, içərisində yaşadığı cəmiyyətlə, onun tarixi ilə, onun istəkləri ilə heç bir tarixçinin tanış edə bilməyəcəyi bir tərzdə tanış edir, nəhayət, o elə məntiqi anlayışlar və fəlsəfi görüşlər verir ki, əlbəttə, bunu heç bir filosof verə bilməz”. (21,113)

Demək, düşüncənin inkişafi söz ehtiyyatının çoxluğundan, ünsiyyət vasitəsi olan dildən asılıdır. Odur ki, milli dil xəzinəmizdə elə söz və ifadələr, rəvayətlərlə bağlı bayatılar var ki, onlar çox boyük və dərin məntiqi yükə malikdir. Onların məna açımını, çözümünü və şərhini verdikcə ana dilimizin incə çalarlara kökləndiyinin şahidi oluruq.

XI əsrdə Qətran Təbrizi sözün böyük təsir qüvvəsinə malik olduğunu, insan hisslərini riqqətə gətirdiyini qeyd etməklə, sözü ruhun ölçüsü adlandırır., ona görə sözün özünə də ölçü lazım olduğunu vacib sayır ki, onu başa salmaq, anlatmaq mümkün olsun:

Söz ruhun ölçüsüdür, ağıl isə tərəzisidir,
Ölçü sözə lazımdır, ancaq miqdarı tərəzi təyin edər.
Hər sözü dilə gətirmək mümkündür, lakin
Hər sözü ağla qandırmaq çətin və müşküldür.

XII əsrdə isə Nizami Gəncəvi yuxarıdakı fikirlərin davamı kimi sözlərin düşüncədən asılı olduğunu söyləyir:

Hər söz düşüncəylə deyilsin gərək,
Qaç o sözlərdən ki, mənasız, boşdur.
Düşüncəsi, ağlı sağlam olan kəs
Lüzumsuz sözləri söyləməz əbəs.

Məntiqə söykənməyən sözün mənası olmaz. Odur ki, əşyalara ad verən Dədə Qorqud bəzən yanıldığını etiraf etmiş, sözün məna yükünün onun məzmunu ilə vəhdət təşkil etdiyini nəzərə alaraq belə söyləmişdir:

Gəlinə ayıran demədim, mən Dədə Qorqud,

Ayrana doyuran demədim, mən Dədə Qorqud,
İynəyə tikən demədim, mən Dədə Qorqud,
Tikənə sökən demədim, mən Dədə Qorqud.

Forma məzmun vəhdətinin, sözün daxili yükünün onun məna çaları ilə uyğun gəlməsini XVI əsrdə dahi Füzuli də qeyd etmişdir:

Söz mənadan asılıdır, məna sözdən hər zaman,
Bir-birindən asılıdır necə ki, cism ilə can.

Sözün məna anlamının müxtəlifliyi və işlənmə məqamlarının münasibliyi X-XI əsr ədəbi nəzəri fikrində də öz əksini tapmışdır. “Qabusnamə” əsərində belə bir deyim diqqəti cəlb edir: “...söz dörd cürdür: birini nə bilərlər, nə deyərlər, birini həm bilərlər, həm də deyərlər, birini deyərlər, lakin bilməzlər, birini bilərlər, lakin deməzlər. Bu dörd növ sözün hərəsinin iki üzü vardır: biri gözəl, biri çirkin”. (21,45)

Doğrudan da maraqlıdır bu dörd cür olan sözlər hansı sözlərdir?! Birinci qrup sözlər aydındır ki, bilmədiyin sözü demək olmaz, ikinci qrup sözlər isə ümumişlək sözlərdir ki, bilərlər və deyərlər, üçüncü qrup sözlər isə dilimizin genefondunda olan və işlənmə məqamını bildiyimiz, işlətdiyimiz halda mənasını tam anlamadan, tam dərk etmədən mexaniki olaraq nitq prosesində işlətdiyimiz sözlərdir ki, belə sözlərin məna açımını məntiqi düşüncəyə və elmi araşdırmaya əsaslanaraq dəqiqləşdirmək mümkündür. Məsələn, belə sözlərdən bir neçəsinə diqqət yetirək: başına kül; başına daş; ətini yeyər, sümüyünü atmaz; dovşanı araba ilə tutarlar; ağ meydan; ağ eləmisən; əliallahı uşaq; alla vara, nə olur olsun; o qara bir daşdır, onu götürən də peşimandır, qoyan da; Araz aşığımdandır, Kür topuğumdan; onun dərdi Novruz dərdidir və s.

Nəhayət, dördüncü qrup sözlər isə deyilməsi qəbahət sayılan tabulardır ki, hamı o sözləri bilir, lakin şüurlu surətdə nitqlərində işlətmirlər.

Yuxarıda üçüncü qrup sözlərə (deyərlər, lakin bilməzlər) aid verilmiş nümunələrin məna anlamına, məntiqi yozumuna diqqət yetirək:

**Başına kül ifadəsi** ən çox qadınlara məxsus sözdür ki, işlədirlər. (Aley, başına kül...) Araşdırmaya əsasən belə qənaətə gəlmişəm ki, ən qədim zamanlarda tibb elmi inkişaf etmədiyi bir dövrdə insanlar quduzluq xəstəliyinə tutulanda onu müalicə etmək mümkün olmurmuş. Odur ki, xəstəni öldürürlərmiş, lakin doğmalarının gözü qarşısında kimisə öldürmək əzablı görünüş olduğuna görə adamı tək bacalı dama salıb qapısını bağlayıb, lazım olan suyu və yeməyi bacadan verirlərmiş. Xəstə ölənə qədər damda saxlayarmışlar. Bir gün dam üstünə kül tökən qarı bilmir ki, damda xəstə var. Qarı bilmədən külü bacanın yanına tökmək istəyir, lakin kül bacadan damın içinə—xəstənin başına tökülür. Qarı qışqırtı səsi eşidir, baxıb görür ki, xəstə o dəqiqə öldü. Qarı gördüklərini olduğu kimi hamıya danışır. Başa düşürlər ki, qudurmuş adamın asanlıqla öldürülməsi üsulu onun başına kül tökməkdir. Odur ki, o zamandan belə bir qarğış formalaşır; “Səni görüm, qudurasan, dama qatıb, başına kül ələyib, səni öldürələr”. Qısa şəkildə deyilən “başına kül” ifadəsinin mənası belədir.

**Başına daş** ifadəsi də dəfn mərasimi ilə bağlı yaranmış qarğışdır, yəni səni görüm ölləsən, sənə əhlət daşı, baş daşı qoyalar.

**Ətini yeyər, sümüyünü atmaz** ifadəsi qədim dövrlərdə olan bir adətlə bağlı yaranmışdır. Qədim zamanlarda insan vəfat etdikdə meyidi xüsusi yerlərə qoyurmuşlar ki, onun ətini qurd-quş yesin. Bu proses başa çatdıqdan sonra ölü sahibi sümükləri dəfn edərmiş. Yiyəsi, sahibi olmayanın sümüyü ortalıqda qaldıqda çox böyük qəbahət sayılarmış. Odur ki, o zamandan ətini yedirdər, sümüyünü atmaz, yəni dəfn edər kimi deyilmiş fikir bu günümüzə qədər dəyişilmiş və ətini yesə də, sümüyünü atmaz şəklində gəlib çatmışdır. Bəlkə də, əti sənin, sümüyü mənim ifadəsi də bu adətlə bağlı yaranmış və deyilmişdir.

**Dovşanı araba ilə tutarlar.** Qarabağda “dovşan” ləqəbi ilə məşhur olan bir qaçaq var imiş. Bu qaçaq sovet hakimiyyəti illərində qaçaq düşmüşmüş. O, xalqa ziyan vurub, camaata sataşırmış. Gəlin aparan arabalara (o zaman gəlini araba ilə aparanlarmış) hücum edər, gəlini qaçırıb özününkü edərmiş. Heç kəs onu tuta bilmədiyi üçün ona “dovşan” ləqəbi veriblərmiş. Bir gün milis işçiləri(o zaman polis milis adlanırmış) qadın paltarı və mülki paltar geyib, guya toy edib araba ilə gəlin aparan kimi özlərini göstərirlər. Bu zaman “dovşan” hücuma keçib gəlini götürmək istədikdə onu arabada tuturlar. Odur ki, xalq arasında belə bir deyim formalaşır: “Bu hökumət “dovşanı” araba ilə tutan hökumətdir”. İndi isə budeyim belə işlənir ki, “dovşanı” araba ilə tutarlar.

**Ağ meydan, Ağ eləmisən** ifadələrindəki ağ sözü doğru, həqiqət və gerçəkliklərin reallaşması mənasında işlənir.

**O, qara bir daşdır, onu götürən də peşimandır, qoyan da.** Bu fikrin dəymədüşər adamlar üçün, yəni xarakteri bir anın içində yüz dəfə dəyişən adamlar üçün deyirlər. O, adamlar üçün deyirlər ki, bilmirsən, hə deyəsən yaxşı olasan yoxsa, yox deyəsən yaxşı olasan. Bu fikir Makedoniyalı İsgəndər dövründən formalaşmağa başlayıb. Belə ki, dirilik suyu axtaran İsgəndər başının dəstəsi ilə qaranlıq dünyaya daxil olur. Görürlər ki, ətraf qara daşlarla doludur. Kimi bu qara daşlardan nümunə üçün götürür, kimi əlinə alıb yerə tullayır. Işıqlı dünyaya çıxdıqda görürlər ki, götürülmüş qara daş deyil, ləldir. Ona görə də götürən də peşiman olur ki, niyə çox götürmədim, tullayanda peşiman olur ki, niyə götürmədim. Odur ki, deyirlər: o, zülmətin qara daşıdır, götürən də peşimandır, götürməyən də.

**Araz aşığımdandır, Kür topuğumdan.** Mirəli Seyidovun “Azərbaycan mifik təfəkkürünün qaynaqları” kitabında belə bir əfsanə ilə tanış oluruq: “Uzaq keçmişdə burada nəhəng adamlar yaşayırmış. Onlardan Uğuz adlı birisi Kür çayından 40-50 km aralı yaşasa da əyilib bu çaydan su içə bilərmiş. Bunun üçün o bir ayağını Sac dağına, o biri ayağını Çoban dağına qoyub döşü ilə

yaylacığa söykənərək, başını Kür çayına uzadarmış. Uğuz Kürü ən dərin çay sayarmış. Kür Uğuzun topuğundan imiş”. (32,259)

Məncə, Araz aşığımdandır, Kür topuğumdan ifadəsi bu əfsanə əsasında formalaşmışdır.

**Onun dərdi Novruz dərdidir** fikri eşqə düşən, sevən adamlara deyirlər. Qədim zamanlarda il boyu hazırlıq işləri görərmişlər, toy isə yazda, Novruz bayramında olarmış. Odur ki, Novruz dərdi toy ilə bağlı deyilən söz kimi başa düşülür. Başqa bir ehtimal isə “Novruz və Qəndab” dastanı ilə bağlıdır ki, Novruz eşqə mübtəla olduğu üçün eşq onun dərdi sayılır. Bu gün eşqə düçar olanlara “onun dərdi Novruz dərdidir—deyirlər.

Yuxarıda verilmiş şərhlər, izah və ehtimallar ana dilimizin çox böyük və dərin məntiqi məna yükünə, incə çalarlara malik olduğunu şərtləndirir. “Minlərlə söz—minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə--sözün arxeoloqu olmaqla elmi daha da zənginləşdirmək, tarixi saxtalaşdırmalardan xilas etmək olar. Hər bir söz daxili “yükə”—məzmuna malikdir; sözə yaşarlılıq verən onun “bətndəki yükdür”. Söz məhz öz daxili yükünün “nüvəsindəki yüklü hissəciyin” hesabına yaranmışdır”. (22,315-325)

Azərbaycanın dahi şairi Nizami Gəncəvi sözə qiymət verərək onu dünyanın naxışı, insanların şah əsəri kimi dəyərləndirir:

Səncə, köhnə qızılmı, təzə sözmü yaxşıdır?
Söz sərrafı söylədi: “söz dünyanın naxışıdır”! (40,48)

Dünyanın bəzəyi, naxışı olan sözün dəyəri onun mənasında, daşıdığı yükün məna dərinliyindədir. Məna dərinliyi isə söz cıdırında yaranır. Sözün işlənmə məqamları, ifadə tərzləri, mətnaltı çalarları məntiqi təfəkkürün yer aldığı sahələrdir. Odur ki, ədəbiyyatın obrazlar dünyasında, söz cıdırının meydanında məntiqi düşüncənin inkişafına nəzər salmaq, nümunələrlə şərh etmək vacib məsələlərdəndir. Çünki söz fikri ifadənin vasitəçisi kimi düşüncəyə bağlıdır:

Sözün qanadları var quş kimi incə-incə,

Dünyada söz olmasa nəyə gərək düşüncə.
Düşüncənin munisi, gözəl sirdaşı sözdür,
Unutma ki, insanın əzəl sirdaşı sözdür. (40,47)

Obrazlılığı yaradan təkcə sözlər deyildir, sözləri təşkil edən səslər də portretli obrazlılıq yaradır. Odur ki, səslər fonetik-qrafik vasitə sayılır:

“A”-dan ana yazdıq, “b”-dənsə baba,
“V”-dən vətən yazdıq, “e”-dən el-oba.
Ana dilimizi bu səslərlə sən,
Ruhuna, qəlbinə həkk edəcəksən.

B.Vahabzadə

Və yaxud

Sitəminlə “a” yazıldı,
Sinəmdəki yar yanına...
Səni görcək dilimdən “-sız”,
Düşdü etibar yanına.
Yüz yanından bir silindi,
Sevincim həddi bilindi.
Gözlərimdə, ay qız, indi,
“Tər” qonubdu “tər” yanına.

Ş.Əsgərov.

Demək, dili təşkil edən səslər, sözlər, söz birləşmələri və cümlələr fikrin ifadəsinə xidmət edən əsas vasitələrdir. Fikrin ifadəsi zamanı sözün məna yükü məntiqi düşüncəyə əsaslanır. Məntiqi düşüncə obrazlı təfəkkürün bütün sahələrini əhatə edir. Mətnaltı mənaların çözümü də məntiqi düşüncəyə əsaslanır. Odur ki, ədəbiyyatda işlənən mətnaltı mənalar məntiqi təfəkkürün amilidir. Təlmihlər, bədii təsvir və ifadə vasitələri də məntiqi təfəkkürə söykənir. Məntiqi təfəkkürün gözü bəsirət gözüdür, altıncı duyğudur. Bu duyğunun köməyi ilə nağıllarda ortaya atılmış sim, nar, qanlı daş, zəncir və s. əşyaların fikir ifadə etməsi, oxunması məntiqi təfəkkürün, məntiqi düşüncənin inkişafı ilə bağlıdır.

Dərin məntiqi məna yükünə malik olan bayatılarımız minlərlədir. Belə bayatılardan eləsi vardır ki, söyləyən kimi bayatının məna yükü aydın bir şəkildə dinləyənə çatır:

Yaradan var,
Yer-göyü yaradan var.
Dostum mənə əl vurma,
Məndə hər yaradan var.

Elə bayatılar da vardır ki, onların izahını, yaranma şəraitini və şərhini vermədən bayatını söylədikdə, bayatı anlaşılmır, fikir dinləyənə tam şəkildə aydın çatmır, bayatı sönük və mənasız görünür. Lakin izah və şərh verdikdə məna yükü, məntiqi dərinlik, bayatı duyumu insanı valeh edir. Odur ki, bir neçə rəvayətlə bağlı, hadisələr əsasında yaranmış bayatıları diqqətinizə çatdırırıq:

Mən aşiq qan ayağı,
Qan əli, qan ayağı.
Aşiq bir hikmət görüb,
Üç başı on ayağı.

İlk baxışda əl və ayağın qan olduğu kimi anlaşılır və əsas məqsəddən fikir yayınır, amma məlum olanda ki, Sarı Aşiq təsvir etdiyi məsələnin obyekti inək, sağıcı və buzovdur, onda aydın olur ki, müəllif demək istəyir ki, əli və ayağı qanmaq lazımdır. Sarı Aşiq gedib görür ki, bir qadın buzovu inəyin ayağına bağlayıb, inəyi sağır. Bunların üçünün üç başı və on ayaqları var. Odur ki, belə bir bayatı icad etmişdir.

Qaşıq aşı bişirər
Bilməz naşı bişirər.
Aşiq belə görübdu,
Ayaq başı bişirər.

Sarı Aşiq taxıl zəmisində uşaqların küləş odlayıb sünbülü ütərək ovub yediklərinin şahidi olur və ona görə də bu bayatını söyləyir.

Nəhayət, bu nəticəyə gəlmək olur ki, söz bizim həyatımız, bütün varlığımızdır. Sözsüz, düşüncəsiz insan ola bilməz. Bunu

XII əsrdə dərk edən, bugünümüz və gələcək nəsillər üçün bəyan edən Nizami Gəncəvi dahiyanə ustalıqla belə təsvir etmişdir:

Söz eşqin lüğətində öz canımızdır bizim,
Biz—sözük, görkəmimiz—eyvanımızdır bizim.
Düşüncələr, xəyallar min-min əsər bitirər,
Onu sözün quşları mənzilinə yetirər.
Yeniliklər törədən bu qoca kainatda
Sözdən incə, kəsərli heç nə yoxdur həyatda. (40,47)

İ.P.Pavlov demişdir ki, məhz söz bizi insan etdi. Odur ki, “Azərbaycan dili soy kökümüzün, adət-ənənələrimizin və tarixi-mizin ən düzgün yaddaşıdır. O, həmişə hər yerdə xalqımızın tükənməz mənəvi sərvətlər xəzinəsi, milli qeyrəti və namusu kimi qorunmalı, doğma ana tək əzizlənməlidir”. (16,8) Söz, dil, insan—bunları biri-birindən ayrı təsəvvür etmək mümkün deyildir. Sözsüz dil, dilsiz insan ola bilməz. Bunların üçü də məntiqi düşüncəni şərtləndirir.

# ADLARIMIZA QARŞI GENOSİD

XIX əsrin əvvəllərində Rusiya Azərbaycanı işğal etdikdən sonra öz hökmranlığını möhkəmlətmək və işğal etdiyi ərazilərdə manqurtlaşdırma siyasəti yeritmək, münaqişə ocaqları yaratmaq kimi perspektiv planlar qarşıya qoymuş və bu planları uğurla yerinə yetirmişdir. Belə bir "parçala hökm et" siyasətini erməni siyasəti adlandırıram. Ümumiyyətlə, Azərbaycan türk millətinə, dövlətçiliyinə, ərazi bütövlüyünə qarşı çevrilmiş hər bir ideya və idealogiyanı erməni siyasəti kimi dərk edirəm. Bu erməni siyasətinin məqsədi hansı yolla olursa olsun Azərbaycan türk millətini yox etmək, Azərbaycan torpaqlarını özününküləşdirmək üçün müxtəlif üsullara, variantlara əl atmaqla Azərbaycanı xəritədən silməkdir.

Rus şovinizmilə erməni məkri 200 ildir ki, Azərbaycan türk millətini məhv etmək siyasəti ilə bir çox işlər görmüş, dədə-baba torpaqlarımızda özlərinə vətən yaratmış, əcdadlarımız olan Albanların ər tayfasının adı altında gizlənən haylar Alban torpaqlarına sahib çıxmışlar.

Belə qənaətə gəlmişəm ki, Ərmən Alban tayfası imiş. Bütün Türk tayfaları ilə və eləcə də Albanlarla düşmən mövqedə olan haylar Ərmən tayfasının xristian olmasından istifadə edərək həmin tayfanın adı altında gizlənmişlər. Ona görə belə etmişlər ki, Alban torpaqlarına sahib dursunlar, vətənsiz bir tayfa özlərinə vətən tapsınlar. Bu ideya onların daimi olaraq xain xislətini tənzimləyən atribut kimi səciyyələnir. Ərmən Alban tayfası Irəvan xanlığının ərazisində yerləşirmiş. Gəlmə tayfa olan haylar Ərmən tayfasını assimliyasiya etmişdir. Ərmən Alban tayfası ilə düşmən mövqedə olan haylar daimi olaraq Alban tayfalarını təqib etmiş, işgəncələr vermiş, qırğınlar törətmiş, tarixin yaddaşında silinməz izlər qoymuşlar. O qədər haylar Türk tayfalarını qovmuşlar ki, bu gün də tələsik bir iş gördükdə-«nə olub, hay gəlir?!»-deyirlər. Yəni ən qəddar düşmən və quduz xalq haylar daimi olaraq türklərin qənimi olmuşdur.

Ərmən sözünün mənası mən igidəm deməkdir. Filolofiya elmləri doktoru,professor Sadıq Şükürov da belə bir doğru nəticəyə gəlmişdir ki,"ərmən"sözü xalis türk sözüdür(7). Hay tayfaları Ərmən Alban tayfasını tarixən assimliyasiya etmiş və Ərmən adını özləri üçün millət adı seçmişlər. Onlar «ərmən» adını «erməni» formasında qəbul etmişlər. Xalq arasında belə bir fikir dolaşır ki, guya «er»-yer, «məni»-mənim (yer mənimdir) deməkdir. Daimi olaraq yer iddiasında olduqları üçün belə ad seçiblər.

Irəvan sözünü də Yerevan etmişlər. Bu sözdə də daimi yer iddiasında olan haylar «yer» sözündən əl çəkməmişlər. Bu gün erməni dediyimiz xəyanət çamurluğu qədim dövrdə hay və yaşadıqları ərazi isə Hayıstan adlanırmış.

"... erməni kilsəsi Albaniyada ölkəni erməniləşdirmək aləti olmuşdur..... Erməni kilsəsi "Albaniyanın bütün kilsələrində sülh"ü yalnız yadelli işğalçıların köməyi ilə bərqərar edirdi, erməni katolikosluğunun mənafeyi hər dəfə tələb etdikdə erməni kilsəsi həmişə yadelli işğalçılarının köməyinə əl atır, "xaç bayrağı ilə öz yolu üzərində tarixi Albaniya və onun bir hissəsi olan Qarabağ (Arsax) xalqlarını" yox edirdi" (36,11)

Bu yoxetmə bu gün sözün həqiqi mənasında tam başa çatmışdır. Azərbaycanın dədə-baba torpağı olan İrəvan xanlığında və Qarabağ bölgəsində haylar hay salıb, qıy vururlar.

Bizim babamız, cəddimiz olan Albanlardan bizi uzaqlaşdırıb özlərini Alban yurdunun varisləri elan ediblər. Xaça, xristianlığa qarşı bizdə kin, küdurət oyadıb özləri isə sonradan xristian və xaçik olublar. Halbuki Albanlar xristianlığı ermənilərdən 270 il əvvəl qəbul etmişlər. Ermənilər xaçı bizə «pıxı», özləri üçün «çiçi» kimi təbliğ ediblər. Lakin bu gün də dədə- babalardan bizə yadigar qalmış adət və ənənələrdə xaça tapınma özünü göstərir. Məsələn, atlarda bəd xassəli şiş olduqda onun üstünə xaç şəkilli dağ çəkirlər ki, bədxassəli şiş çəkilsin, yox olsun. Yəni xaç xeyir qüvvə kimi qəbul edilir. Və yaxud bu gün də çörək bişirilərkən onun üzərinə xaç işarəsi çəkirlər. Ulu soylarımızın çoxunun

damğası xaç şəklində olmuşdur. Qədim onomastik adlarımızın xaçla bağlı olması fikrimizi bir daha sübut edir: Məs: Xaçınyalı kəndi, Xaçın çayı, Xaçbulaq yaylağı, Zümürxaç kəndi, Xaçmaz rayonu və s.

Ermənilər Azərbaycan xalqına qarşı yürütdüyü məhvetmə siyasətində ərəblərlə, farslarla bir nöqtədə birləşirlər. Belə ki, Islam dinini qılınc gücünə Azərbaycan xalqına qəbul etdirənlər bu xalqı ilkin mənəviyyatından, soy kökündən, inam və inancından, dinindən ayırıblar. Ermənilər də başqa prizmadan yanaşıb Azərbaycan xalqında xiristianlığa qarşı, xaça qarşı ikrah hissi oyadıblar. Bax bu iki məqam eyni nöqtədə birləşir. Hər iki yanaşmanın məqsədi Azərbaycan xalqını öz soy kökündən uzaqlaşdırmaqdır. Ermənilərin isə bu məsələyə belə yanaşmalarının iki məqsədi vardır. Birincisi Azərbaycan xalqının tarixən düşməni olan erməni bu xalqı məhv etmək, manqurdlaşdırmaq istəyir, ikincisi isə ondan irəli gəlir ki, özləri Azərbaycan xalqının soy kökü olan Alban tayfasının birinin adı altında gizlənmiş “hay” dır. Ona görə də Azərbaycan xalqını soy kökündən uzaqlaşdırmağa hər an cəhd göstərir. Məlumbur ki, Albaniya 26 tayfanı əhatə etmişdir. Bu 26 tayfanın əksəriyyəti Türk tayfaları olmuşdur. Alban tayfaları Albaniya ərazisinin sahibi imiş. Bu ərazilərdə “hay” tayfası yaşamayıbdır. “Hay”ların bu məkanda tarixən əraziləri olmayıb. Lakin bu ərazilərə köçürülən“hay”lar özlərinə əbədi məkan seçmək üçün “Ərmən” Alban tayfasının adı altında gizlənib, Albanyanın Ərmənlər yaşayan Ərməniyyə torpaqlarına sahib durublar. Odur ki, onlar heç vaxt razı olmazlar ki, Azərbaycanlılar öz soy kökünə bələd olsunlar və xristian dininin onlardan əvvəl qəbul etmiş babalarını tanısınlar. Axı tarixdən məlumdur ki, Albanlar xiristianlığı “hay”lardan 270 il əvvəl qəbul ediblər. Həmçinin bir də ona görə “hay”lar Ərmən Alban tayfasının adı altında gizlənmişlər ki, həm özlərini Albanların varisləri saysınlar, həm də guya xristianlığı əvvəlcədən qəbul etdiklərini sübut etsinlər. Alban tayfalarından bu günümüzə qədər özünü qoruyub saxlayan və bu gün də öz

qədim Alban milli qüruru ilə yaşayan İngiloylar Azərbaycanda 14,9 min nəfərdir. “İngiloylar (14, 9 min nəfər, 1999) dini mənsubiyyətinə görə xristian (gürcü pravoslav kilsəsi) və müsəlman ingiloylara ayrılır. Müsəlmanlar Zakatala rayonunun Əliabad, Mosul və Balakən rayonunun İtitala kəndlərində, xristian ingiloylar isə Qax rayonunun 9 kəndində yaşayırlar. Qədimdə onların yaşadıqları ərazi Kambisena (Ereti) adlanırdı və əsas əhalisi ingiloyların əcdadları hesab olunan er və qel tayfalarından ibarət idi. Burada Alban kilsəsi fəaliyyət göstərirdi. İngiloyların bir hissəsi sonradan zorla gürcüləşdirilmiş Alban tayfalarının qalıqlarıdır”.(6,107)

Verilmiş sitatdan aydın olur ki, er tayfası Alban tayfası olmuşdur. Haylar bu tayfanın adı altında gizlənmişlər. Məşhur dilçi alim İlhami Cəfərsoylu qədim mənbələrə əsaslanaraq bu barədə belə qeyd etmişdir: “Erivan şəhəri e. ö. 782-ci ildə erlərin yurdunda salınmışdır. Mixiyazılı mənbələrdə adları İrpuni və Eriani kimi göstərilən yerlər Göyçə gölü bölgəsinin türk mənşəli qədim sakinləri idilər. Onlar burada Urartu dövlətinin yaranmasından qabaq yaşayırdılar.

Tarixi Armini indiki Ermənistan deyildi. O zamankı ermənilər Van gölü, Çarox çayı sahillərində, Taron və Sasun vilayətlərində yaşayırdılar. Ararat və Alagöz dağlarının ətəkləri, Arpa çay və Göyçə gölünün arası Su, Göksu, Ulduz, Ayli, Koyaş (günəş), Çupan (çoban) və başqa türk boylarının əzəli yurdu olmuşdur.”(17,5)

Lakin tarixi nə qədər saxtalaşdırsalar da, tarixin daş yaddaşı həqiqəti üzə çıxarır. Bunu ermənilərin öz yazarları da qələmə almışlar. Q.Kapantsyan “Xayasa-kolibel armyan” (Yerevan, 1948) əsərində qeyd etmişdir ki, ermənilər VII əsrədək Kiçik Asiyada Hayasa adlı əyalətdə yaşadıqlarına görə “hay” adlandırılmışlar. Buradan aydın olur ki, bunlar erməni deyil haydırlar. Bü gün də onlar bir-birindən millətini soruşduqda- hayes? – (ermənisən?) –deyirlər.

Müasir elmi araşdırmaya əsasən erməni adlandırdığımız bu riyakarlıq çamurluğu Hind-Avropa mənşəli friqlərin bir qoludur. Ulu əcdadları eradan əvvəl XII əsrdə Balkanlardan Kiçik Asiyaya köçmüş, Hayase əyalətində məskunlaşmış, e.ə. VII əsrdə Urartu dövlətinə qatılmışlar. Urartulular onların bir hissəsini indiki Ermənistan ərazisinə köçürmüşlər.

Buradan aydın olur ki, erməni adlandırılan xalqın adı "hay"dır və yaşadıqları ərazi isə "Hayistan" adlanırmış. Ermənistan ərazisinə gəlmədirlər. Ermənistan qədim Alban tayfası olan Ərmənlərin yaşadıqları Ərməniyyə torpaqlarıdır.

Belə bir nəticəyə gəlmişəm ki, erməni dili də qədim alban dili əsasında formalaşıbdır. Çünki, ermənilər buqələmun xalq olduğu üçün nə varsa assimliyasiya edir, özününküləşdirir. Odur ki, Alban mədəniyyəti bizə erməni dilində gəlib çatmışdır. Erməni kimi tanınan bu xalq Ərməniyyə torpağına yiyələnmiş haylardır. Haylar özgə malını, dilini, yerini, mədəniyyətini və s. tez mənimsəyən, ümumiyyətlə, buqələmun olan bir şeydilər.

Bu fikri Alban dilini, mədəniyyətini, əlifbasını, ümumiyyətlə, Alban izini yer üzündən silib erməniləşdirən hayların tarixi gedişləri,durumları və xarakterik xüsusiyyətləri şərtləndirir."Mingəçevirdəki qazıntı zamanı tapılan Alban əlifbası parçaları təsdiq edir ki,v-vıı əsrlərdə Arranın öz yerli yazısı var idi və bu yazı ölkədə ərəb hökmüranlığı daha qurulmazdan əvvəl mövcud olmuşdur...Arranda yazılı mənbələr və ədəbiyyat xəlıfə Əbd ül-Malikin(685-705) hökmranlığı dövründən başlayaraq məhv edilmiş və ya sıxışdırılıb aradan çıxarılmışdır. Divanxanalar ərəb dilinə keçdi,Alban yazısı ,habelə fars və Xarəzm yazıları,əhali içərisində savadlı təbəqələrin azlığı və qriqoryan kilsəsinin təzyiqi üzündən sıxışdırılıb unuduldu və təbii olaraq məhv oldu.Erməni dili Alban dilini əvəz etdi."(12,58)

Bizim dövrümüz çoxəsirlik dünya qazanında bişmiş sinxronik bir aləmdir. Biz bu aləmdə şamanlıq, büdpərəstlik, hər bir şeyə tapınma, xristianlıq, islamçılıq və s. anlamları görə bilərik. Tarixin inkişaf xətti və fəlsəfi duyum, bunu bizə imkan

verir deyək ki, bütün bəşəriyyətin son nöqtədə birləşmə ehtimalı labüddür. Çünki bəşər övladının başlanğıcı və sonu eyni nöqtədə dərk olunur. Yuxarıda söylənilən fikirlərin təsdiqini görkəmli filoloq alim, əməkdar elm xadimi, mərhum professor Mirəli Seyidovun “Azərbaycan xalqının soykökyny düşünərkən” əsərində tapa bilirik. M.Seyidov yazmışdır: “…Azərbaycandilli qəbilələrin, qəbilə birləşmələrinin eradan on dörd yüz il qabaq Azərbaycanda yaşaması haqqında bilgi vardır. Sonrakı yüzilliklərdə (IV-III) onlar burada elliklə yaşamış və vaxtaşırı el-el buraya gəlib qohum, qardaş qəbiləbirləşmələrinə qaynayıb-qarışmışlar.

Burada yaşayan və eradan qabaq axınla gələn türkdillilərin dili azı-azı eranın ilk yüzilliklərindən tutmuş ümümxalq danışıq dili qatına yüksəlirdi. Belə olmasaydı, aşağıda görəcəyimiz kimi, V yüzillikdə “Dəli Domrul boyu” Qafqazda, xüsusilə Ermənistanda, Gürcüstanda yayılmazdı və onun yaxından iştirakı ilə əsərlər yaranmazdı. Musa Qağanqatlı əsərində göstərir ki, hələ eranın V yüzilliyində Qazan xan və onun qardaşı haqqında tarixi əfsanə, ola bilsin elə lap əsl əfsanə varmış. Və tarixçi onu az-çox dəyişikliklə əsərinə salmışdır. Ola bilsin ki, Qazanxan əfsanəsini tarixiləşdirmişdir. Deməli Dəli Domrul əfsanəsi, Qazan xan tarixi əfsanə hələ V yüzillikdə Qafqazda Azərbaycan dilində yayılıbmış. Çoxdan-eradan 14 yüz il qabaq yaşamış və sonradan axın halında gələnlər Qafqazda türk dilinin qatını daha da artırmış və bu da Azərbaycan dilinin yayılma arealını genişləndirmişdir, tarixi şərait, ictimai mühit ətrafdakı dillərə təsir etməyə, qarşılıqlı ilişgilərə əsas yaratmışdır. Belə bir durumda mədəni, dil bağları daha da genişlənirdi. Eranın ilk yüzilliklərindən böyük axınla xəzərlər, az sonra hunlar və b. qəbiləbirləşmələri, xalqlar Qafqaza gəlirlər. Türk qatı böyüyür, genişlənir, ictimai durumu daha da möhkəmlənir. Belə bir durumun qonşu dillərə, xüsusilə erməni dilinə təsiri özünü açıqca göstərir. Bu dil hadisəsini duyan görkəmli bilici H.Acaryan əlli ildən çox müasir erməni dili

(aşğarapar) ilə əski erməni dili (qrapar) arasındakı böyük, ciddi ayrılıq, fərq haqqında düşünmüş və axırda yazmışdır:

“Erməni dili strukturunun (sintaksis nəzərdə tutulur-M.S.) quruluşuna görə öz çevrəsində olan və onu işğal edən dillərin-latıncanın, yunancanın, fransızcanın, ərəbcənin, assoricənin və hətta kürdcənin strukturuna quruluşuna uyğun ola-ola birdən-birə bunlardan uzaqlaşır və türk-tatar dillərinin strukturuna oxşayır? Bu oxşayış tamam təsadüfidirmi? Erməni dilinin struktur qurluşunun dəyişilməsinin səbəbləri yoxdurmu?”(H.Acaryan, Erməni dilinin tarixi, Yerevan, 1951, səh. 292)

H.Acaryan erməni dilindəki böyük dəyişikliklərdən bəhs edərək yazır ki, hər kəs qraparla aşğarapar müqayisə edərsə ən kiçik məsələdə belə böyük müxtəlifliyi, fərqi görər. Müəllif fikrini isbat etmək üçün bir çox qrammatik məsələləri misal çəkir. O, feldə, təyində və s. dəyişiklikləri göstərir. Erməni dilinin qruluşundakı ciddi dəyişikliyə H.Acaryan VII yüzilliyin tarixçisi Hovhonnes Mamikonyanın, XI yüzilliyin şairi Heraqasinin dilində tuş olarakən təəccüblənmişdir.

Bizcə, Hovhannes Mamikonyanın dilindəki dəyişiklik təbii dil hadisəsidir. Əgər Mamikonyanların köklərinin uyğurlarla qan qohumluğu göz qarşısına gətirilərsə, onda məsələ az-çox aydın olar. Görünür ki, türkdilli Mamikonyanlar erməniləşərkən qraparın qrammatik quruluşunda istər-istəməz dəyişiklik etmişlər”. (36,436)

Buradan bir daha aydın olur ki,ermənilər türk tayfasının adı altında gizlənib dilinin qrammatik strukturunu da türk dilinin təsiri altında formalaşdırıblar.

“Aparılan araşdırmalar və tədqiqatlar nəticəsində aydın olur ki,ermənilər müxtəlif vaxtlarda gah Əhəməni fars imperiyasının,gah Makedoniyalı İsgədərin,gah Azərbaycan-Atropatenanın,gah da türklərin hakimiyyəti altında olmüşlar. Onu da qeyd etmək lazımdır ki,ermənilər hansı dövlətin ərazisində yaşayırdısa,o dövlətin tarixini özününkü kimi qələmə verməyə,ona şərik çıxmağa başlayırdılar.Mənbələrin birində qeyd

edilir ki,beləliklə,”süni şəkildə yazılan və təbliğ olunan”erməni xalqının tarixi”həqiqətdə ayrı-ayrı erməni olmayan etnik feodalların tarixidir”.(24,25).

Azərbaycanlı dedikdə Azərbaycanda yaşayan Azərbaycan xalqı nəzərdə tutulur. Burada gürcü, erməni, rus, ləzgi, türk, kürd və s. millətlər yaşayırlar. Gürcüstanlı dedikdə orada yaşayan bütün millətlər (gürcülər, ermənilər, ruslar, Azərbaycan türkləri və s.) nəzərdə tutulur. Eləcə də rusiyalı, polşalı, macarıstanlı və s. dedikdə orada yaşayan bütün millətlər nəzərdə tutulur. Odur ki, “azərbaycanlı” ifadəsi də sovet dönəmində millətimizin adının unudulması üçün işlədilmiş erməni siyasətinin bir variantıdır. Çünki “böyük Ermənistan” sovet idealogiyasına əsasən Azərbaycan türkü yox edilməli, bir millət kimi dərk olunmamalı idi. Əgər belə olmasaydı gürcüstanlılar içərisində gürcülər, ermənistanlılar içərisində erməni milləti, rusiyalılar içərisində rus milləti və s. olduğu halda azərbaycanlılar içərisində bizim millətin adı nədir?! Rus imperiyası 70 il ərzində Azərbaycanda xalq, Ermənistanda isə millət formalaşdırımışdır.

Məncə, bizim millətin adı Azərbaycan türküdür. Türk adını bizim üstümüzdən silməklə soy kökümüzdən, ulu mədəniyyətimizdən bizi təcrid etməklə, manqurdlaşma siyasəti yürütmüşlər. 70 il Azərbaycan türkü Sovet imperiyasının əsarəti altında olsa da, dünya miqyaslı həyat xalısında Azərbaycançılıq ilməsini nəqş etmişdir.

Amma bu gün biz bir millət kimi Azərbaycan türkü adlanmalıyıq, öz Dədə Qorqud adımızı özümüzə qaytarmalıyıq. Azərbaycanlı olmağı ilə Azərbaycanda yaşayan bütün millətlər fəxr edə bilər. Çünki Azərbaycan dünyanın cənnət məkanıdır. Bütün millətlər burada yaşamaq və azərbaycanlı olmaq arzusundadır. Ulu öndərimiz Heydər Əlirza oğlu Əliyev bu barədə demişdir: “Mən azərbaycanlı olmağımla fəxr edirəm!”. Bu fikir həm də Azərbaycan türkü ifadəsi mənasında işlədilmişdir. Odur ki, mən də ulu öndərimizin söylədiyi fikrin davamı olaraq bir millətin nümayəndəsi kimi, yəni Azərbaycan türkü olmağımla

fəxr edirəm. Azərbaycan dilində bütün millətlər danışa bilər, lakin bu dili Azərbaycan türk millətinin Azərbaycan türkü qorumalı, sevməli və bütün dünyada təbliğ etməlidir. Çünki bu dil Azərbaycan türk dilidir.

Azərbaycan xalqı çoxmillətli tərkibə malikdir. Azərbaycanda əhalinin milli tərkibə görə 90,6%-ni Azərbaycan türkləri təşkil edir. Lakin burada başqa millətlərin nümayəndələri də yaşayırlar. Bəzən "başqa millətlərin nümayəndələri" əvəzinə "başqa xalqların nümayəndələri" ifadəsi işlədilir ki, bu ifadə də yanlışdır. Çünki hər bir dövlətin öz xalqı və xalqının milli tərkibi vardır. Ona görə də hər bir dövlətin, xalqının milli tərkibi də müxtəlifdir. Bu baxımdan ayrı-ayrı xalqların milli-tərkibi Azərbaycanda ola bilməz. Odur ki, Azərbaycanda ayrı-ayrı xalqların deyil, millətlərin nümayəndələri yaşayırlar. Burada Rus, Ləzgi, Gürcü və s. millətlərin nümayəndələri vardır ki, sovet dövründə bunlara "az saylı xalqlar" deyirdilər. Bu ifadə də yanlışdır. Az saylı xalq olmaz, xalqın içərisində millətin say tərkibinə görə az və ya çoxluğu ola bilər. Odur ki, Azərbaycanda 7953,9 mln. nəfər xalqın milli tərkibə görə sayı (1999-cu il siyahıya alınmaya əsasən) aşağıdakı kimidir:

| | sayı (min nəfərlə) | Yekuna nisbətən % lə |
|---|---|---|
| 1. Azərbaycan türkləri– | 7205,5 mln. nəfər | 90,6 |
| 2. Ləzgilər – | 178,0 | 2,2 |
| 3. Ruslar – | 141,7 | 1,8 |
| 4. Ermənilər – | 120,7 | 1,5 |
| 5. Talışlar – | 76,8 | 1,0 |
| 6. Avarlar – | 50,9 | 0,6 |
| 7. Türklər – | 43,9 | 0,5 |
| 8. Tatarlar – | 30,0 | 0,4 |
| 9. Ukraynalılar – | 29,0 | 0,4 |
| 10. Saxurlar – | 15,9 | 0,2 |
| 11. Gürcülər – | 14,9 | 0,2 |
| 12. Kürdlər – | 13,1 | 0,2 |
| 13. Tatlar – | 10,9 | 0,3 |

| | | |
|---|---|---|
| 14. Yəhudilər – | 8,9 | 0,1 |
| 15. Udinlər – | 4,2 | 0,05 |
| 16. Digərləri – | 9,5 | (1,95) |

Burada milli tərkibi və sayı göstərilən bu millətlər Azərbaycanda yaşadıqları üçün azərbaycanlı adlanırlar və bunlar Azərbaycan xalqını təmsil edirlər. Göründüyü kimi azərbaycanlı dedikdə ən azı 16 millət nəzərdə tutulur ki, bu da 7953,4 min nəfər Azərbaycan xalqı deməkdir. Bunların içərisində isə Azərbaycan türkləri 7205,5 min nəfər təşkil edir, 747,9 min nəfər isə digər millətlərin nümayəndələridir.

Qətranı qaynatsan da şəkərə çevrilə bilmədiyi kimi, başqa millətlərin adını, soyadını dəyişməklə türkləşə bilməz. Ona görə də hər bir millətin öz adı, soyadı və xisləti vardır. Erməni Azərbaycanda yaşayıb, adını və soyadını dəyişib, “Həcər südü əmmişəm, babam Koroğludur, Nəbidir, Cavanşirdir”- deməklə türkləşmir, əslində millətimizi təhqir edir.

Azərbaycanlı adı altında gizlənən və hal-hazırda Azərbaycanda məskunlaşan 120,7 min nəfər erməni istirahətli evlərdə yaşayır. Vətənində məcburi köçkün olan 1 milyona yaxın Azərbaycan türkü isə evsiz və insan hüququ olmayan kölə vəziyyətindədir. Bəs, buna nə ad vermək olar?!

Hərbi xidmət zamanı mənimlə bərabər azərbaycanlı adı altında (bu azərbaycanlı adı sanki komunizm yorğanıdır ki, millətləri yığıblar altına) gizlənən erməni xidmət edirsə, o hansı vətənə xidmət edəcək?! Mənim vətənimi ermənidən qoruyacaqmı?! Yoxsa ermənilərin təhlükəsizliyi üçün qarant rolunu oynayacaq?! Və yaxud məqam gözləyib məni arxadan vurmayacağına kim zəmanət verə bilər.?! Erməniyə etibar etmək olarmı?! Qarı düşmən dost olarmı, keçsə də min il?!

Erməni siyasətinin variantlarından biri də Azərbaycan ərazisində türk soykökü ilə bağlı onomastik vahidlərin məqsədli şəkildə dəyişdirilməsi olmuşdur. Məsələn, Gəncə-Yelizavetpol və yaxud Kirovabad, Şəki-Nuxa, Beyləqan-Jdanov, Tərtər-Mirbəşir, Qəbələ-Qurtqaşen, Oğuz-Vartaşen və s. yer adları dəyişdirilərək

ilkin həqiqi anlamından uzaqlaşdırılmaqla doğma soy leksikasına biganəlik, unutqanlıq psixologiyası aşılamışlar. Həmçinin başqa millətlərdən olan azlıqlara muxtariyyət verməklə bərabər onların yerləşdiyi əraziləri sanki özəlləşdirib, təmizləmə aparmaqla, oradakı adları da dəyişdirib Azərbaycansızlaşdırmaq məqsədi güdmüşlər. Erməni yaşadığı əraziləri erməniləşdirsə, dərd yarıdır. Hətta yaşamadığı ərazilərin də adlarını dəyişib, Azərbaycan torpaqlarına erməni damğası vururlar. Azərbaycanda hara ayaq basırlarsa, orada erməni xaçı basdırır, alban xaçlarını erməniləşdirirlər, bir sözlə, erməni siyasəti yürüdürlər. Bu siyasət Azərbaycanda daimi olaraq qədimdən bu günə kimi davam etdirilmişdir. Bu erməni siyasətinin yalnız bir məqsədi olmuşdur, Azərbaycanı özününküləşdirmək və Azərbaycan türklərini yox etmək. Bu siyasəti rus çarizmi hər vasitə ilə tətbiq etməyə çalışmışdır. Bəzi sərhəd zonalarında iddialı millətləri yerləşdirməklə, yer adlarını dəyişməklə, türklərə məxsus qurd adları ilə bağlı əraziləri rus dilində “Kurt” formasında səsləndirib, yazıya almış və sonradan “kürd” kimi ortaya qoymaqla məqsədli şəkildə erməni siyasətinin rus variantını həyata keçirmişlər. Məsələn, aşağıda adları qeyd olunan kəndlərdə bir nəfər də olsun kürd yaşamır və kürdlə bağlı heç bir əlaqə yoxdur: Cəbrail rayonunda Qurdlar-Kürdlər, Füzuli rayonunda Qurdlar-Kürdlər, Qurdmahmudlu-Kürdmahmudlu, Ağdam rayonunda Qurdlar-Kürdlər, Ağcabədidə Qurdlar-Kürdlər, Goranboyda Balakürd,, Səfikürd, Laçında Kürdhacı və s. kənd adları qurdla bağlı olsalar da, Sovet dönəmində “Kürd” adı altında formalaşdırılmışdır. Məlumdur ki, ruslar qurda “kurt”, kürdə isə “kyurd”(körd) deyirlər. Odur ki, tarixi sənədlərdə yuxarıda adları qeyd olunan kəndlərin adı “kurt” şəklində yazıya alınmışdır ki, bu da qurd sözü ilə bağlıdır. Əgər bu adlar “kürd”lə bağlı olsaydı ruslar onu “kyurd”(körd) kimi qələmə alardılar.

Ümumiyyətlə, Azərbaycanda Azərbaycançılıqdan kənar nəyə əl atılırsa, bu erməni siyasətinin bir variantıdır. Biz ayrı-ayrı millətlərə vətənimizdə yer vermişik ki, yaşasınlar, onu

parçalamağa çalışan hər bir nəfər erməni xislətli, düşmən niyyətlidir. Düşmən niyyətlilərə vətənimizdə yer yoxdur.

Gəlin ulu öndərimizin tarixi kəlamına əməl edib, azərbaycanlı olmağımızla fəxr edək.

Ermənilər haqqında yuxarıda söylənilən fikirlərin təsdiqi və faktı kimi ayrı-ayrı dövrlərdə dünya alimləri, tarixçiləri, səyyahları, ümumiyyətlə, dünya yazarları tərəfindən sübut və dəlil olaraq qələmə alınmış bir neçə aforizmi diqqətinizə çatdırmağı özümə borc sandım:

1. Bu xalq istər xasiyyətinə, istərsə də coğrafi vəziyyətinə görə lap qədimdən ikiüzlü və riyakardır. Bunlar daim romalılara nifrətdən, parfiyalılara isə həsəddən az qala partlayırlar.

**Tatsit.**

---

2. Ermənilər həmişə başqa dinə qulluq edən hökmdarların hakimiyyəti altında olublar. Nəticədə öz fikir, niyyət və duyğuları gizli saxlayan, hiyləgər, məkrli və kələkbaz adamlara çevriliblər.

**Aleksandr Düma.**

3. Ermənilər acgöz və tamahkar, fitnəkar və araqarışdırandırlar. Heç kəsi bəyənməzlər. Onlar xırda bir işi şişirdib, hay-küy salmaqda istedad sahibidirlər və intiriqanı sevirlər.

**Vilson (ingilis siyasi xadimi)**

4. Ermənilərin kökünü bir xalq kimi kəsmədiyimə görə gələcək nəsillər mənə ya rəhmət oxuyacaqlar, ya da lənət. (2)

**Əmir Teymur.**

## Xalqımızın qan yaddaşı

Azərbaycan ərazisi Rusiya və Iran tərəfindən işğal olunana qədər təxminən 410 min kv.km olmuşdur. 1828-ci ildə Iran və Rusiya dövlətləri Azərbaycanın ərazisini iki hissəyə bölmüş, Iran 280 min kv.km, Rusiya isə 130 min kv.km sahəni zəbt etmişdir.

1918-ci ildə Rusiyanın işğalı altında olan Azərbaycan ərazisinin 9 min kv.km-i, yəni Irəvan xanlığı ermənilərə verilmişdir. Həmçinin 7 min kv.km ərazisi olan Dərbənd xanlığı hal-hazırda Rusiyanın əsarətindədir. Rus dövləti hissə-hissə Azərbaycan ərazilərini müxtəlif dövrlərdə Ermənistana, Gürcüstana (Zəngəzur, Göyçə, Şərur, Dərələyəz, Dilican, Borçalı və s.) pay kimi verilmişdir. Bu ərazilərin təxmini sahəsi 27,4 min kv.km-dir.

1991-ci ildə Azərbaycan Rusiyanın əsarətindən xilas olanda Azərbaycanın ərazisi 86,6 min kv.km. idi. Lakin məlum erməni təcavüzü nəticəsində topaqlarımız yenidən işğala məruz qaldı.

| № | Işğal olunan ərazinin adı | Işğal tarixi | Sahəsi |
|---|---|---|---|
| | Dağlıq Qarabağ Muxtar Vilayəti | 1988-1993-cü illər | 4400 kv. km. |
| | Laçın | 18 may 1992 | 1833 kv. km. |
| | Kəlbəcər | 3- 4 aprel 1993 | 1936 kv. km. |
| | Füzuli | 23 avqust 1993 | 1386 kv. km. |
| | Cəbrayıl | 18 avqust 1993 | 1050 kv. km. |
| | Ağdam | 23 iyul 1993 | 1050 kv. km. |
| | Qubadlı | 31 avqust 1993 | 802 kv. km. |
| | Zəngilan | 30 oktyabr 1993 | 707 kv. km. |

Buradan aydın olur ki, 410 min kv. km. əraziyə malik olan Azərbaycanın təxminən 83% ərazisi işğal altındadır. Hal-hazırda biz dədə-baba torpaqlarımızın 17%-nə sahibik. Nə qədər dəhşəti olsa da reallıq belədir.

## Son söz əvəzi.

### Qüdrətdən yanan ocağı heç kəs söndürə bilməz.

"Özünün yeni yüksəliş dövrünü yaşayan çağdaş Türk dünyası bəşər sivilizasiyasına yeni misilsiz nümunələr vermək iqtidarındadır. Bu gün öz suverenliyini əldə etmiş bir çox Türk cümhuriyyətlərinin bir sıraya qoyulması Türk dünyasının gələcəyinə işıqlı ümidlər oyadır. İqtisadi, siyasi və mədəni həyatın sıx telləri ilə birləşməyə başlamış Türk xalqları yeni dünyanın amillərindən birinə çevrilməkdir." Heydər Əliyev.

Böyük türk dünyası bir sıra xalqların formalaşmasında (rus, erməni və s.) mənbə olmuşsa da, onu bir başlanğıc od kimi söndürməyə, parçalamağa çalışmışlar. Lakin qüdrətdən yanan ocağı söndürmək mümkün olmadığı kimi böyük türk dünyasını, türkçülük ideologiyasını parçalasalar da, onu məhv etmək, söndürmək mümkün deyildir. Uzun illərdən bəri tüstülənə-tüstülənə tarixə yoldaşlıq edən türk dünyası XXI əsrdə alovlanacaq və əvvəlki mənbə ocağına çevriləcək. Mən buna əminəm. Vaxtilə türklər rusların, ermənilərin soykökünün formalaşmasında az rol oynamamışlar. Biz bünü mərhum professor Ziya Bünyadovun tədqiqatlarında, Ilhami Cəfərsoylunun «Türklər rusların soy kökündə» və s. əsərlərdən aydın görə bilərik. Ruslar cəngavərliyi türklərdən öyrənmiş və «baranovlar» mübariz, döyüşkən kimi formalaşmışlar. Bizim xalqımız isə uğurlardan xumarlanmış, uyumuşdur. Bu uyqu Oğuz elinin genindədir. «Oğuz igidlərinə nə bəla gəlsə yuxudan gəlir». Bu eli ayıltmaq lazımdı. Özünə qaytarmaq, soy kökünə tapınmaq, kimi ideyalara səsləmək lazımdır:

- Nə yatmısan, qoca vulkan, səninləyəm,
Ayağa dur,Azərbaycan, səninləyəm!

M.Araz.

Bu eli elə ayıltmaq lazımdır ki, din pərdəsi altında qanımızı sormağa, Vətənimizi məhv etməyə, dilimizi əlimizdən almağa

daimi meyilli olan tarixi düşmənlərimizi birdəfəlik tanısın. Tanısın ki, - «Qarı düşmən dost olmaz, keçsə də min il».

Bu xalqı elə ayıltmaq lazımdır ki, daim tikan kimi yarağını hazır tutsun. Yarağını hazır tutsun ki, gülü, Azərbaycan kimi cənnət məkanı əlində saxlaya bilsin.

Nəhayət bu milləti elə ayıltmaq lazımdır ki, soy kökünü unutmasın və tarixin daş yaddaşında əbədi yaşaya bilsin. Bu hüququ bizə heç kim pay verməyəcək, bunu özümüz, hər birimiz qazanmalıyıq. Təsadüfi deyildir ki, sərkərdə igid babamızın adı da Qazan olmuşdur. Bu adın leksik anlamı da bir daha bizi soykök hüququmuzu qazanmağa səsləyir. Odur ki, az da olsa burada Azərbaycana və milli dəyərlərimizə qarşı yönəlmiş hər bir ideologiyanın aşkarlanmasına çalışıb, düşmənin iyrənc xüsusiyyətlərini bəşər övladının diqqətinə çatdırmaqla xalqımızın əzildiyini, torpaqlarımızın işğal olunduğunu bir daha gündəmə gətirmişik. Bununla da qan yaddaşımızın silinməməsinə çalışıb, düşməndən intiqam və qisas almaq üçün xalqımızı və eləcə də bütün türk dünyasını mübarizəyə səsləyirik.

Bizim bədbəxtliyimiz ondadır ki, uzun illərdən bəri talanqarət olunub, işgəncələrə məruz qaldığımızı dərk etmirik. Biz bunu dərk etməli və bütün fəaliyyət sahələrində ağır dərdlərimizi əks etdirib dünya miqyası səviyyəsində təbliğ etmə-liyik. Əzildiyimizi, talanqarət olunduğumuzu əks etdirməkdən çəkinməməliyik, biz bunu qeyrətsizlik sanmamalıyıq. Biz bunu ona görə belə etməliyik ki, mübarizə ruhumuz artsın, bizdə düşmənə qarşı barışmaz ruh formalaşsın, yaddaşsızlıq bəlamıza son qoyulsun.

Biz Nəsiminin dönməzliyini, igidliyini deyil, ona edilən zülmün dərəcəsini, işgəncənin ölçüyə sığmazlığını təbliğ etməliyik. Çünki dözümlülük, səbirli olmaq ideyasının təbliği köləlik fəlsəfəsindən irəli gələn haldır. Xeyir elə həmişə xeyirdir, işin şər başını fikirləşmək lazımdır. Qoy bizim qəhrəmanlığımızı başqaları söyləsin, biz özümüz özümüzü tərifədiyimiz bəsdir. Necə ki, biz nə qədər əzilir, döyülürüksə də qəhrəmanıq deyirik.

Gör necə qəhrəmanıq ki, ermənilər Qarabağda at oynadır, biz isə moizə oxuyuruq. Odur ki, Dədə-Qorqud nəsihəti qulqlarımızda sırqa olmalıdır: “Torpağı qorumqdan, əkib-becərməyə dəyməz, əkib becərmədinsə qorumağa”

## Nəticə

Vətənimizi tanıyaq və tanıdaq layihəsi istiqaməti üzrə Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin tapşırığına əsasən "Ölkəmizi tanıyaq" devizi ilə keçirilən maarifləndirici tur-aksiya respublikamızın bütün bölgələrinin milli-mənəvi dəyərlərini, adət-ənənələrini, unudulmaqda olan sözlərini, öyrənilib, öyrədilməsi və dərsliklərdə öz əksini tapması məsələləri baxımından günün, zamanın ən aktual probleminə çevrilmişdir. Bu problemin müəyyən qədər çözülməsi üçün Laçın rayonu və onun bir guşəsi olan Ərikli kəndi haqqında bir sıra bilgiləri qələmə alıb, gənclərimizi maarifləndirmək məqsədi ilə diqqətinizə çatdırdıq. Bilgilər toplayan zaman aşağıdakı nəticələr əldə olundu.

1. Tam əminliklə deyə bilərik ki, Laçın rayonu qədim Oğuz yurdu, Türk uluslarının yaşayış məskənidir.
2. Laçın rayonu yerləşmə zonasına, dünyada anoloqu olmayan flora və faunasına, özünəməxsus milli-mənəvi dəyərlərinə görə ən mühüm strateji əhəmiyyət daşıyır.
3. Laçın rayonunda işlənən bir çox sözlərin qədim Şumer dili və Alban dili ilə ortaqlı olması bu diyarın qədim dövrlərlə səsləşdiyinin şahidi oluruq. Belə sözlərdən bir neçəsinə diqqət yetirək.

**Azərbaycanca -------------------------Şumer dilində**
Kiş(dağı)--------------Kiş (etnosdur)
Şapı(addır—lovğalıq mənasını verir)-----Şapı(addır)
Abışqa(pəncərə)---------------abışqa
Bağır(qaraciyər)---------------bağır
Dirək-----------------dirək
Əlik(cüyür)---------əlik
Qışdax(qış yurdu)----qışdaq
Qıy(əyri, çəpəki)------qıy
Onq(asan,işin onqad olsun)----onq
Öfgə(ağ ciyər)---------öfgə

**Azərbaycanca-------------------------Albanca**
Əprəmək(ət yaxşı bişdikdə asanlıqla sümükdən ayrılır ki, buna əprəmək deyilir)------------------epritməx
Əmdərmək(su dolu qabı çevirmək)-----emdərmək
Əlik(cüyür)-----------------əlik
Əmgək(başın üst hissəsi)-------əmgək
Əski(qədim, köhnə parça qırığı)-------əski
Harayçı(savaşanı ayıran)----harayçı
Genqışmaq(məsləhətləşmək)-----genqəşməx və s.,və i.a.

1593-cü ildə Osmanlı dövləti Məğaviz nahiyyəsinin oba, kənd, qışlaq və məzrələrini siyahıya alıbdı. Həmin siyahıda Qarasaqqal kənd adı da qeyd olunubdur. Hal-hazırda Laçın rayonunun Qarasaqal kəndi Qurdqajı inzibati ərazi vahidinə daxildir.

“Qarasaqqal oyk. , sadə. Kürdəmir rayonunun eyniadlı i.ə.v.- də kənd. Nazir çayının (Girdiman çayının qolu.) sağ sahilində, Şirvan düzündədir. Kəndin adı onu bina edən qarasaqqal nəslinin adı ilə bağlıdır”. (1, 35.) Fikrimizcə, bu kəndin adı Qarasaqqal nəslinin adı ilə bağlı deyil, Qarasaklar nəslinin adı ilə bağlıdır. Qarasaqqal tayfa, nəsil adı bildirsəydi, onda ağsaqqal ifadəsi ondan qabaq nəsil, tayfa adı bildirmiş olardı. Çünki ibtidai icma adövründən bu yana ağsaqqal sözü, ağsaqqal hörməti, ağsaqqal müdrikliyi daim xalqımızın güvənc yeri olubdur. Necə ola bilər ki, ağsaqqal sözü tayfa birliyi, nəsil adı bildirmədi, qarasaqqal sözü nəsil adı bildirdi?! Odur ki, bu kəndlərin adı Qarasaqqal adlansa da, Qarasaklar nəslinin adi ilə bağlıdir.

Saklar ─ dedikdə türk tayfaları birliyinin adı nəzərdə tutulur. Bu tayfalardan Qan sak (Qanzak), Ər sak (Ərsak), Qara sak adı), Ba sak (şəxs adı) və sairənin adını qeyd edə bilərik.

“Sakların vətəni Orta Asiya və Qazaxıstan çölləri hesab olunur. Eradan əvvəl VIII əsrdə onlar Qara dənizin şimal sahillərinə, oradan Cənubi Qafqaza Ermənistan və Azərbaycan

ərazisinə gəlib burada yaşamışlar. Etnik mənsubiyyətcə onlar xalis qədim türkdilli etnosdur.”

Orta Asiyada saklar haqqında e. ə. V əsrdən başlayaraq antik müəlliflər yazmışlar. Lakin onların bəziləri sakları ənənəvi olaraq “skif” adlandırırlar.

“Saklar Azərbaycan xalqının qədim tarixində dərin iz qoymuş və Azərbaycan xalqının etnogenezində mühüm rol oynamış qədim etnoslardan biridir.

Saklar miladdan qabaq VII əsrdə Cənubi Qafqazda məskunlaşdıqdan sonra çarlıq yaratdılar. Tarixşünaslıqda bu “Skif çarlığı” adlanır, lakin bu sak çarlığıdır. Çarlığın mərkəzi indiki Gəncə bölgəsini əhatə edən Sakasena idi. Çarlığın məhz Sak çarlığı olması onun Bibliyada “Aşkenaz” adı ilə göstərilməsi ilə təsdiq olunur, çünki “Aşkenaz” Saklara verilmiş ad sayılır.

Sakların bir hissəsi Şimali Azərbaycan ərazisində yaşayırdı. İndiki coğrafi kordinatlarla göstərilsə, burada Saklar Şəki, Şakaşen, Sisakan və Arsak bölgələrində məskun idilər.” (3,151-161.)

Burada adı çəkilən Şəki, Şakaşen, Sisakan və Arsak sözlərində sak etnonimi aydın görünür.

Aydın Qaradağlı “Qarabağ onun qədim tayfaları və toponimləri” kitabında da Saklar haqqında verilmiş məlumatları bir daha təsdiqləyir. O, yazmışdır: “Miladdan əvvəl 7-8-ci yüzilliklərdə Altaydan qərbə doğru – öncə Orta Asiyaya, oradan da Qara dənizin şimal sahillərinə, sonra da bir qismi Xəzərin cənubuna, Ön Asiyaya və o cümlədən, miladdan öncə, 673-cü ildə Azərbaycana axın etmişlər. Onların böyük bir qismi Gəncə-Qazax bölgəsində mərkəzi dövlət qurumundan ibarət bir çarlıq yaratmışlar.

Bu məlumat alban səlnaməçisi M. Kalankatuklunun “Gəncə Şakaşenada meydana gəlmişdir” ifadəsində də təsdiq olunur. İ. Dayaknova görə bu Sak çarlığı sonralar Güney Azərbaycanın da xeyli ərazisini əhatə edirdi. Saklar öz çarlığının hüdudlarını

genişləndirərək Arsak əyalətində, Kür-Araz ovalığında (Balasakan) hakim rola malik idilər.” (7, 44-45.)

Bu sitatdan aydın olur ki, Saklar öz çarlığının hüdudlarını getdikcə genişləndirmişlər. Odur ki, bu çarlığın hüdudları genişlənərək Zəngəzuru da əhatə etmişdir. Zəngəzurun bir parçası olan indiki Laçın rayonu bütövlükdə vaxtı ilə Sak çarlığının hakimiyyətinə tabe idi. Odur ki, burada qara Sakların məskunlaşması təbii hal idi. Bugünkü Qarasaqqal/ Qarasaklar kəndi tarixən Sak etnoslarının yaşayış məskəni olmuşdur.

Hamının bildiyi və işlətdiyi etnonim (qəbilə, tayfa və nəsil adı), toponim (coğrafi adlar), oykonim (şəhər, kənd adları), oronim (dağ, zirvə adları), hidronim (su obyektlərinin adları), antroponim (şəxs adları), fitonom (bitki adları) və zoonimlər (heyvan adları) adi sözlər deyil, bu sözlərdə xalqımızın tarixi, milli mənşəyi və məkanı, əsli-kökü, soyu-soyadı bütöv halda qorunub saxlanılır. Odur ki, “Azərbaycan dili soy kökümüzün adət-ənənələrimizin, mədəniyyətimizin və tariximizin ən düzgün yaddaşıdır. O, həmişə hər yerdə xalqımızın tükənməz mənəvi sərvətlər xəzinəsi, milli qeyrəti və namusu kimi qorunmalı, doğma ana tək əzizlənməlidir.” (16,8)

Saklar haqqında yuxarıda qeyd edimiş məlumatları tarixin eksponat yaddaşı olan onomastik vahidlərimiz öz məna və anlam duyumlarında qoruyub saxlamışdır. Bunu bu gün dilimizdə olan Şəki, Sakasena əyaləti, Sisakan (Zəngəzurda), Sisyan, Balasakan, Qarasaqqal (Qarasklar), Aqsaka/ Aqıska/Axısxa (Ağ saklar), Arsak (Ər saklar) və s. toponimlər və Pisak, Basak, İşpakay, Tomris və s. kimi şəxs adları təsdiq edir.

“Minlərlə söz --- minlərlə sənəddir. Bu sənədləri oxuya bilməklə --- sözün arxeoloqu olmaqla elmi daha da zənginləş-dirmək, tarixi saxtalaşdırmalardan xilas etmək olar. Hər bir söz daxili “yükə”--- məzmuna malikdir; sözə yaşarlılıq verən onun “bətndəki yükdür”. Söz məhz öz daxili yükünün, “nüvəsindəki yüklü hissəciyin” hesabına yaranmışdır.” (22, 315-325).

Qədim Türk tayfa birliyi olan Sakların Laçın rayonu ərazisinin ən qədim sakinləri olması faktı bir daha bu diyarın ən qədim Türk uluslarının yaşayış məskəni, Oğuz yurdu olduğunu bəyan edir.

Xalq arasında bəd bir xəstəlikdən, şikəstlikdən danışılarkən hamı qulaqlarını dartıb kiş-kiş deyə əllərini yelləyirlər. Sanki bununla şər qüvvələri qovmuş olurlar. Deməк, kiş nəyisə qovmaq məqamında söylənilir. Vaxtilə insanlar şər qüvvələri dəf etməkdə aciz olmuşlar. Odur ki, mənim zənnimcə, güclü sayılan və şər qüvvələrə qarşı mübarizədə qalib gələnlərə kiş-i demişlər. Kişi adam güclü ərən, igid kimi nəzərdə tutulmuşdur.

Müasir dövrümüzdə Şəki rayonunda Kiş kəndi, Kiş çayı vardır.Kiş kəndi elə bir qorxulu yerdə salınmışdır ki, dağlardan axan güclü sel kəndi yuyub apara bilər. Kiş çayı dəfələrlə tüğyan etmiş, qarşısına nə keçmişsə yuyub aparmışdır. Xalq bu adı ona görə vermişdir ki, şər qüvvəni qova bilsin, kiş deməklə şər qüvvələri yox etmiş olsun.

Laçın rayonunda Kiş dağı vardır. Xalq arasında bu dağa Keş dağı deyirdilər. Keş dağı müqəddəs dağ sayılırdı, burada qədim dövrlərdə zəyərəkdən yağ çıxarırmışlar. (Zərb zəyərəkdən yağ çıxarar deyimi bu gün də işlənir) Dünya görmüş nənə və babalardan öyrənmişdim ki, bu dağa ona görə Kiş və yaxud Keş adı veriblər ki, bu dağ dərd azaldır, şər qüvvələri qovur. Odur ki, kimin ağır dərdi olanda, dərdini bu dağa söyləyərmiş və kiş-kiş deyib, dağdan imdad diləyərmiş. Ona görə də bu dağa Kiş dağı deyiblər ki, şər qüvvələri qovsun, dərdləri yox etsin.

Bağır adlı bir kişinin oğlu ölür. Bağır kişi dərdlərini unut-maq üçün bu dağa çıxıb lola (lola bayatı mənasında işlənən sözdür) söylərmiş, odur ki, Bağır kişiyə xalq arasında Lola Bağır deyərmişlər. Bu gün həmin kişinin kəndi Lolabağırlı adlanır. Bağır şəxs adı Alban dövrünə aiddir. Kiş sözü isə daha qədim dövrə Şumər//Şumer dövrünə aid anlama malik sözdür.(7,66)

Laçın rayonunda Qarakeşiş adlanan kənd var idi. Qarakeşiş adlandırılan bu kənd əslində Qarakeş kəndidir. Bu kənddə də

kişlilər məskunlaşdığı üçün kənd Qarakiş kəndi adlanmışdır. Tələffüzdə isə Qarakeş kimi özünə ünvan qazanmışdır. Hal-hazırda bu kəndin adını dəyişib rəsmi sənədlərdə Qarakeçdi yazırlar, lakin bu kəndin adı Qarakiş və yaxud Qarakeş olmalıdır.Bu toponimlər kis, kiş və yaxud keş adları ilə bəlli olan etnosun adı ilə bağlıdır.

Yuxarıda verilmiş şərhlər xalq etimalogiyası əsasında söylənilmişdir. Xalq deyimi, duyumu və anlamına dirsəklənib fikir söyləməklə yanaşı, elmi araşdırma, müqayisəli elmi nəticələr əldə etməkdə elmə əsaslanmaq ən optimal variantdır. Bu isə etimaloyi araşdırmanın başlıca amili kimi bizi real həqiqətə qovuşdurur. Elmi ədəbiyyatlardan oyrənirik: “Şumerlər İkiçayarasının sakinləri idi. Onlar burada e.ə. ıv minillikdə məskunlaşmışdılar. Son vaxtlar Şumer dilində bir çox türk mənşəli sözlərin olduğu aşkarlanıb. Şumerdə mövcud olmuş dövlətlər sülalələrin adı ilə tanınırdı. Bunlardan birincisi Kiş sülalə dövlətidir. Kişdən sonra Uruq şəhər dövlətinin yüksəlişi başlanmışdır.

Burada diqqəti cəlb edən Kiş sülaləsidir. Bu sülalənin adı Laçın rayonunda Kiş dağının, Şəkidə Kiş kəndinin və Kiş çayının adlarında özünü qoruyub saxlamışdır. Kiş adı altı min illik tarixi yaddaşı təsdiq edən sənəd kimi tarixin möhür eksponatına çevrilmişdir. Odur ki, biz Azərbaycan ərazisində əcdadlarımızın e.ə. ıv minillikdə bu ərazilərin sahibi olmasının şahidi oluruq.

Kiş adlı qalaların, hətta vilayətin olması barədə məlumatlar vardır. Tədqiqatçı alim filologiya elmləri doktoru İlhami Cəfərsoylunun araşdırmalarındakı məlumatlardan bir neçəsinə diqqət yetirək: “Orta Asiyadan Anadoluyadək neçə Kiş qalası var. Onlar tarixi qaynaqlarda Keş, Qiş, Kiş adıyla göstərilib.

Orta əsrlərdə Səmərqənd yaxınlığında Kiş adlı qala vardı.(Əbdürrəşid əl-Bakuvi, 1992,s. 129)

Kiş adlı ikinci qala isə yurdumuzda idi. “Gülüstani-İrəmdə verilən bilgiyə görə Kiş Şəki xanlığında həm qala, həm də çayın adı olmuşdur. “Əhsənüt-təvarix”də Kiş Şəkidə bir qala kimi

göstərilmişdir. “Şəki tarixi”nin müəllifləri isə həm Kiş adlı qalanın, həm də kəndin olduğunu göstərirlər.

Kiş qalası haqqında ilk bilgilərdən biri “Alban tarixi”ndədir. Kitabda iki yerdə onun adı çəkilir. O yerdə ki, kilsə tikilməsindən söhbət gedir, o, tədqiqatçıların diqqəini daha çox cəlb etmişdir. Məlumdur ki, xristianların kiçik icmalarından biri Uti vilayətində Qiş kəndinin yaxınlığındakı bataqlıq yerdə yaşayırdı (Alban tarixi, 1993, s. 31, 32). Qafqazda ilk kilsə həmin yerdə tikilmişdi.

Başqa bir yerdə göstərilir ki, Ağvan ölkəsi 15 vilayətə bölünür. Onlardan biri eyni adlı şəhərdə Qisdir (Istoriə Aqvan, 1861, c. 362). Bu bilgi bizim üçün qiymətlidir. Ona görə ki, orada Kişin etnotoponim olduğu aydın görünür. Əgər eranın IV əsrində Kiş vilayət və vilayətin baş şəhəri imişsə, deməli, o, daxili müstəqilliyini qoruyub saxlayan etnos olub.

Kişlilər yalnız Qafqazda yox, Orta Asiyada, Altayda və Qərbi Sibirdə də yaşamış və mənbələrdə bir türk boyu kimi göstərilmişdir.

Səfəvilərin zamanında Kiş qalası mühüm müdafiə qalası idi. A.Bakıxanov yazır: Şah Təhmasib 1661-ci ildə Şəki vilayətinin Kiş qalasını tutdu.

XII əsr gürcü salnamələrində həm Kiş qalasının, həm də Kiş tayfasının adı çəkilir. Tiflis arxivlərində saxlanan XVIII yüzil farsdilli sənədlərdə kişlilərin türk olduğu və türk dilində danışdığı öz əksini tapmışdır (Puturidze, 1965,12, 19 və 23 saylı sənədlər).

Buradan görünür ki, keşlilər Şəkinin yaxınlığında—Gürcüstanın şərq və Azərbaycanın qərb sınırları arasında yaşamışlar. XX əsrin ilk illərində Qaradağ mahalında üç Kiş kəndinin qeydə alınması (Doroжnaə karta. Petroqrad, 1917) göstərir ki, onlar yalnız Albaniyanın sakinləri deyillər.

Kiş adının paralellərinə Şumer yazılarında təsadüf edirik.”(28, 126-128)

Qədim Şumer dünyasından bu gün bizə bəlli olan ədəbi incilər Şumer-Azərbaycan türk ədəbi mühitini şərtləndirir. Ilkin mifik təsəvvürlər , ağılar atalar sözləri və zərb-məsəllər, müdrik

kəlamlar, təmsil bədii yaradıcılıq növü, hekayə yaradıcılığı, dastan yaradıcılığı Şumer-Azərbaycan türk mənəvi qohumluğunu sübut edir. Ona görə də bu nəticəyə gəlirik ki, əcdadlarımız sayılan etnoslardan biri də, şumer dünyasından süzülüb gələn, kiş etnosu, kişlilərdir. Yaşadıqları əraziləri və tikdikləri qalaları öz adları ilə adlandırmaqla öz izlərini qoymuşlar və demək istəmişlər ki,

Bu qala bizim qala,
Tikdik ki, bizim qala,
Tikmədim özüm qalam.
Tikdim ki, izim qala.

"Türk dillərinin genologiyası: şumer və türk leksik paralelləri" kitabının müəllifi f.e.d. professor Nazim Hüseynli "Ön söz"də Şumer dili ilə türk dillərinin paralelliyini aşağıdakı prinsiplər əsasında şərh etmişdir:

"1. Tarixilik və məntiqilik.
2. Mədəniyyələrarası paralellik.
3. Sivilizasiya və dilin paralelliyi.
4. Etnodünyagörüşlərin oxşarlığı və adların paralelliyi.
5.Dillərin leksikon ənənələri arasında genetik paralellik. (42,19)

Müəllif yuxarıda göstərilən prinsiplər əsasında şumer dili ilə türk dillərinin paralelliyini geniş aspektdə şərh edərək belə bir nəticəyə gəlmişdir: "Təhlilimiz göstərir ki, hər bir etnosun yaratdığı adlar onun kamilliyini, hansı etnosla qohumluq əlaqələri olduğunu göstərən başlıca amillərdəndir. Adın izləri ilə hansı məkanda rastlaşırıqsa, deməli, orada həmin etnosun izi vardır. Məsələn, şumerlərdəki Kiş, Laqaş, Dilmun, Şərur, Susa adlarının Azərbaycan ərazilərində qarşılıqlarına misal olaraq Şəkidə Kiş kəndini, İsmayıllıda Lahıc, Ağsuda Dilman, Naxçıvanda Şərur, Qarabağda Şuşa adlarını göstərmək kifayətdir. Bununla yanaşı, onu da qeyd edək ki, şumerlərin öz adları Kienqeridir. Kəngərli formasında bu adla Azərbaycanın cənub hissəsində, Naxçıvan

ərazisində və Türkmənistan bölgəsində nəsil, yer adları kimi rastlaşırıq.

Dediklərimizi ümumiləşdirərək belə bir nəticəyə gəlmiş oluruq ki, şumerlər və türklər arasında sivilizasiya, linqivistik ənənələr və etnodünyagörüşü parametrlərinə uyğun olaraq genetik qohumluq əlaqələri mövcuddur və onlar eyni soy-kökə malikdirlər."(42,32)

Bu sitatda diqqəti cəlb edən anlamlardan biri də şumerlərin Azərbaycan türk məkanının bütün ərazilərində (Şəkidə, İsmayıllıda, Ağsuda, Naxçıvanda, Qarabağda) izlərinə və sözlərinə rast gəlməyimizdir.

Babalardan bizə miras qalan maddi və milli-mənəvi də-yərlərə sahib çıxmadıqca, unutduqca erməni-haylar həmin dəyərləri öz dəyərləri kimi təqdim edirlər. Odur ki, yaddaşsızlıq, unutqanlıq bəlamıza son qoymalı, milli-mənəvi dəyərlərimizə sahib çıxmalıyıq.

# İstifadə olunmuş ədəbiyyat


1. Azərbaycan toponimlərinin ensiklopedik lüğəti, 2 cilddə, Bakı, 2007.
2. Allahverdi Eminov. Səlim Səlimbəyli ilə üzbəüz, Bakı, 2001.
3. Azərbaycan dilinin orfoqrafiya lüğəti, Bakı-2004.
4. Azərbaycan tarixi, yeddi cilddə, III cild, Bakı, 2007.
5. ASE (IX cild), Bakı-1987.
6. "AME" Elmi Mərkəzi, Bakı, 2007.
7. Aydın Qaradağlı. Qarabağ onun qədim tayfaları və toponimləri, Bakı, 2008.
8. Ayna Uşaq Ensklopediyası «Tarix keçmişdən gələcəyə», Bakı-2004.
9. «Açıq fikir» qəzeti, 20-26 yanvar, 2000-ci il.
10. Azərbaycan folkloru, Bakı, 2005.
11. AMİ-nin Xəbərləri (Elmi-metodik jurnal) 1 saylı, Bakı, 2010.
12. Bünyadov Ziya.Azərbaycan VII-XIX əsrlərdə,Bakı,1989.
13. Bəxtiyar Tuncay. Qafqaz Albanlarının dili və ədəbiyyatı, Qanun Nəşriyyatı, 2010.
14. Elşad Abışov. El-oba adlarının izi ilə, Bakı-2007.
15. Həsən Mirzəyev. Dərələyəz mahalının toponimləri və şivə sözləri, Bakı, 2003.
16. Xasay Cabbarov Mahmud oğlu. Dil quruculuğu və nitq mədəniyyəti, Bakı, 1996.
17. İlhami Cəfərsoylu. Türk dillərində teonim və etnonimlər, Bakı, 2010.
18. 9.Ilhami Cəfərsoylu. Sibirdə Təbriz şəhəri, Bakı, 2005.
19. Ilhami Cəfərsoylu. Türklər rusların soykökündə, Bakı-1995.
20. Ilhami Cəfərsoylu. Tarixi-etimoloci təhlilin köməyi ilə Qarabağ etnonimlərinin tədrisi», Bakı-1991.
21. K.D. Uşinski. Seşilmiş pedaqoji əsərləri, Bakı, 1953.
22. Əjdər Fərzəli Qorqud. Dədə Qorqud sözü, Bakı, 1999.
23. Ə.Fərzəli «Dədə Qorqud yurdu», Bakı-1989.

24. Əli Əliyev. Laçın qədim Oğuz yurdu, Bakı. 2009.
25. Faiq Ismayılov. Tarixin faciəsi Laçın, Bakı-2003.
26. Kitabi-Dədə Qorqud. Bakı, 2004.
27. Qiyasəddin Qeybullayev. Qədim Türklər və Ermənistan, Bakı, 1992.
28. Qiyasəddin Qeybullayev. Azərbaycan türklərinin təşəkkül tarixindən, Bakı, 1992.
29. Laçın yurdu, ədəbi-bədii publisistik dərgi, N 3(10), Bakı, 2013.
30. Məmmədhənifə Musayev, Malik Musayev. Türk dünyası, Bakı, 2004.
31. . Məmməd Aslan. Varlıqla yoxluq arasında. (iki cilddə) I cild, Bakı, 2011.
32. Mirəli Seyidov. Azərbaycan mifik təfəkkürünün qaynaqları, Bakı, 1983.
33. M.Seyidov «Azərbaycan xalqının soykökünü düşünərkən», Bakı-1989.
34. Mərdlik qalası Laçın, Bakı, 2009.
35. Məmmədov Xəqani., Məmmədov Nuru. Erməni iddiaları və azərbaycanlıların soyqırımı, Bakı, 2008.
36. Moisey Kalankatuklu.Albaniya tarixi,Bakı,Elm,1993.
37. Muradxan Cabbarov. Mənim Laçınım, Bakı-1995.
38. Məhərrəm Qasımlı. Novruz Bayramı Ensiklopediyası, Bakı, 2008.
39. Nizami Gəncəvi. İsgədərnamə (Şərəfnamə), Bakı, 2004.
40. Nizami Gəncəvi. Sirlər xəzinəsi, Bakı, 1981.
41. Nazim Tapdıqoğlu. Laçın rayonu və onun toponimiyası (qısa ensiklopedik dərgi) , Bakı: Araz nəşriyyatı, 2005.
42. Nazim Hüseynli, Lalə Məmmədova. Türk dillərinin genologiyası: Şumer və türk leksik paralelləri, Bakı, 2012.
43. N. Kərimov, «Qırx il səyahətdə», Bakı-1977.
44. Nahid Məmmədov. İşğal altındakı tarixi-dini abidələrimiz, 2005.

45. Şükürov Sadıq Uluxanlı.Gəncə,1999.
46. Ş.Fərzəliyev. Azərbaycan XV-XVI əsrlərdə,
47. Y.B. Yusifov, S.K.Kərimov «Toponimikanın əsasları», Bakı-1987.
48. Həvva Məmmədova «Qarabağ General Qubeonatorluğunun erməni tcavüzənə qarşı mübarizə tarixindən səhifələr», Bakı-1999.
49. Qarabağnamələr, (I, II cild) Bakı-1989, 1991.

## Mündəricat



Əliyev Əli Umud oğlu 26 noyabr 1954-cü ildə Laçın rayonunun Ərikli kəndində anadan olmuşdur. 1962-ci ildə birinci sinfə daxil olub, 1972-ci ildə orta məktəbi bitirmişdir. 1972-ci ildə Xankəndi Pedaqoji İnstitutuna (Stepanakert Pedaqoji İnstitutu) daxil olub, 1976-cı ildə institutu bitirmiş. Həmin ildən Ərikli kəndində əmək fəaliyyətinə başlamışdır. On beş il orta məktəbdə ixtisası üzrə müəllim işləmişdir. 1990-cı ildə AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunda dissertant kimi qeydiyyatdan keçmişdir. "Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi-Nəvvab" əsəri" dissertasiya mövzusu kimi təsdiq olunmuşdur. 1990-cı ildən əmək fəaliyyətini N.Tusi adına ADPU-nun Şuşa filialında davam etdirmiş. Məlum Qarabağ hadisələri ilə əlaqədar əmək fəliyyətini Ağcabədi şəhərində davam etdirməli olmuşdur. İnstitutda əvvəlcə baş laborant, sonra müəllim, daha sonra baş müəllim vəzifələrində çalışmış.

"Qarabağ ədəbi mühiti və Mir Möhsün Nəvvabın "Təzkireyi- Nəvvab" əsəri" mövzusunda yazdığı dissertasiyanı filologiya üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün AMEA-nın Nizami adına Ədəbiyyat İnstitutunun nəzdində fəaliyyət göstərən D.01.131-Dissertasiya Şurasında 28 mart 2012-ci il tarixdə müdafiə etmiş və təsdiqini almışdır.

O, AMİ-nin Ağcabədi filialında "Dillər, ədəbiyyat və onların tədrisi metodikası" kafedrasının müdiri vəzifəsində fəaliyyət göstərmiş, hal-hazırda ADPU-nun Ağcabədi filialında Pedaqoji fakültənin dekanıdır. İki monoqrafiya, 40-dan çox elmi-metodiki və tarixi, publisistik məqalələrin müəllifidir.

Ailəlidir, dörd övladı var.